## TİBB VƏ ƏCZAÇILIQ ELMLƏRİ

## MEDICAL AND PHARMACEUTICAL SCIENCES

DOI: https://doi.org/10.36719/2707-1146/40/7-12

**Nərmin Bayramova**
Azərbaycan Tibb Universiteti
narmin.bayramova@amu.edu.az
**Şəymən Həsənova**
Azərbaycan Tibb Universiteti
shayman.hasanova60@gmail.com

# KOLOREKTAL XƏRÇƏNG VƏ ADENOMATOZ POLİPİN DİAQNOSTİKASINDA ANTİMİKROB PEPTİDLƏRİN VƏ SİTOKİNLƏRİN TƏYİNİNİN DİAQNOSTİK ƏHƏMİYYƏTİ

**Xülasə**

Bu işin məqsədi müxtəlif bağırsaq şişləri və adenomatoz polipozu olan xəstələrdə sitokinlərin və antimikrob peptidlərin diaqnostik rolunun müqayisəli tədqiqidir. Bu tədqiqatda müxtəlif bağırsaq şişləri olan 80 xəstə və adenomatoz polipozu olan 17 xəstə müayinə edilmişdir. Bütün xəstələrdə serumda IL-6, TNF-α və FABP-nin konsentrasiyası immunofermentativ analiz ilə müəyyən edilmişdir. Bədxassəli bağırsaq şişi olan xəstələrdə IL-6, TNF-α-nın diskriminasiya səviyyəsi adenomatoz polipi olan xəstələrlə müqayisədə müvafiq olaraq 4,5 və 3 dəfə artmışdır. Adenomatoz polipozu olan xəstələrdə bağırsaq şişləri ilə müqayisədə FABP-də əhəmiyyətli artım müşahidə edilmişdir. Beləliklə, bütün bu markerlər bağırsaq xərçənginin erkən diaqnozu və skrininqi üçün istifadə edilə bilər.

***Açar sözlər:*** *İL-6, TNF-α, FABP, kolorektal xərçəng, defenzin, sitokin*

**Narmin Bayramova**
Azerbaijan Medical University
narmin.bayramova@amu.edu.az
**Shayman Hasanova**
Azerbaijan Medical University
shayman.hasanova60@gmail.com

# The diagnostic utility of cytokines and antimicrobial peptides in the detection of colorectal cancer and adenomatous polyp

**Abstract**

This study compares the use of antimicrobial peptides and cytokines in the diagnosis of individuals with adenomatous polyposis and other intestinal tumors. In this study 17 individuals with adenomatous polyposis and 80 patients with different forms of colorectal cancer were examined. An enzyme immunoassay was used to measure each patient's blood levels of IL-6, TNF-α, and FABP. When compared to individuals with good-quality bowel tumors, patients with malignant bowel tumors had significantly higher levels of IL-6 and TNF-α on 4,5 and 3 occasions, respectively. A significant decrease in the FABP concentration is also observed in patients with malignant bone tumors on the related control. A notable rise in the number of persons with adenomatous polyposis with adenomatous polyposis, a significant increase in FABP was observed than with bowel tumors. Thus, all these markers can be used for early diagnosis and screening for bowel cancer.

***Keywords:*** *IL-6, TNF-α, FABP, colorectal cancer, defensin, cytokine*

## Giriş

Kolorektal xərçəng klinik, rentgenoloji və morfoloji diaqnostikanın çətinlikləri ilə xarakterizə edilir. Kolorektal xərçəng zamanı müşahidə edilən klinik siptomatikanın qeyri-spesifikliyi və onkoloji olmayan xəstəliklərə bənzəməsi şişin inkişafının erkən mərhələlərində diaqnozun qoyulmasında bəzi yanlışlıqlara gətirib çıxara bilər. Əksər tədqiqatçılar bağırsaq xərçənginin patogenezində yeni endogen faktorların, sitokinlərin, apoptozun aktivator və inhibitorları kimi bioloji aktiv maddələrin şiş toxumasının inkişaf mexanizmləri və metastazvermə qabiliyyətinin araşdırılmasında böyük rolu olduğunu qeyd edirlər (Burke, 1996: 578). Hesab edilir ki, xəstəliyin erkən diaqnostikası və adekvat müalicə taktikasının seçilməsində interleykinlərin, antimikrob peptidlərin öyrənilməsi vacibdir (Akdis, 2011: 8).

Bu patologiyaların sürətli və aqressiv klinik gedişi, müalicənin qeyri-qənaətbəxş nəticələri ilə xüsusi diqqət tələb edir. Xəstəliklərin əsasən yetkin yaşlarda aşkar edilməsi bu problemin sosial və iqtisadi baxımdan da vacibliyini əks etdirir (Anjali, 2011: 182).

Bədxassəli şişlərin diaqnostikasının mühüm mərhələsi olan morfoloji analiz materialın götürülməsinə imkan verən xüsusi müayinə metodlarının tətbiqini tələb edir. Lakin bu metodların bəzisi travmatik olub, şişin disseminasiyası təhlükəsi yarada, damar zədələnməsi və qanaxma ilə müşayiət edilə bilər (Atsumi, 2014: 8).

Məlumdur ki, klinik praktikada istifadə edilən testlər ideal deyil. Mövcud müayinə metodlarının optimal seçilməsi və alınmış nəticələrin interpretasiyası üçün hər metodun imkanlarını öyrənmək vacibdir. Metodun etibarlı olması onun spesifikliyi, həssaslığı, həmçinin nəticələrin düzgünlüyü və tədqiqat nəticələrinin istifadəyə yararlı olması ilə xarakterizə edilir (Balkwill, 2009: 364).

Son zamanlar laborator müayinələrin effektivliyini yoxlamaq üçün ROC (Receiver Operating Characteristic - testin işçi xarakterik əyrisi) tədqiqtından istifadə edilir. ROC metodu həssaslıq və spesifiklik arasında uyğunluqla xarakterizə edilir. ROC laborator testlərin diaqnostik əhəmiyyətini obyektiv qiymətləndirməyə imkan verir. Bu metod vasitəsilə müxtəlif xəstəliklərin diaqnostikasında istifadə edilən testlər də müqayisəli qiymətləndirilə bilər. Bu metod araşdırılan testlərin qiymətləndirilməsində istifadə edilən interpretatorların fərdi meyarlarını təyin etməyə imkan verir (Barbet, 2005: 6077).

**Tədqiqat işinin məqsədi.** Onkoloji prosesin molekulyar mexanizmlərində vacib rolu olan sitokinlərin və antimikrob peptidlərin təyininin kolorektal xərçəngnin və adenomatoz polipin diaqnostikasında rolunu müqayisəli qiymətləndirmək olmuşdur.

**Tədqiqatın material və metodları.** Tədqiqata Azərbaycan Tibb Universitetinin Onkoloji klinikasında kolorektal xərçəng diaqnozu ilə müayinə və müalicə edilmiş 80 xəstənin, ATU-nun Tədris-Cərrahiyyə klinikasında adenomatoz diaqnozu ilə müayinə və müalicə edilmiş 17 xəstənin və 25 praktik sağlam şəxsin materialları daxildir. Tədqiqata cəlb edilmiş xəstələr 4 qrupa bölünmüşlər. Birinci qrupu xoşxassəli bağırsaq xərçəng diaqnozu qoyulmuş 26 xəstə, ikinci qrupa bədxassəli kolorektal xərçəng olan 19 xəstə, üçüncü qrupa metastatik (ikincili) kolorektal xərçəng diaqnozu qoyulmuş 35 xəstə, dördüncü qrupa isə adenomatoz polip olan 17 xəstə daxil edilmişdir.

Bütün xəstələrdə klinik-instrumental müayinələr - rentgenoqrafiya, qarın boşluğunun, qadınlarda kiçik çanaq orqanlarının ultrasəs müayinəsi, təyinat üzrə kompyuter və maqnit-rezonans tomoqrafiyası aparılmışdır.

Qan serumunda İL-6 (interleykin 6) və TNF-α (şiş nekrozu amili) qatılığı ABŞ-ın "RD" firmasına məxsus reaktiv dəstinin vasitəsilə İFA üsulu ilə aparılmışdır. Qan serumunda FABP-ın (piy turşularını birləşdirən protein) qatılığı "Cloud-Clone Corp" firmasının reaktiv dəsti vasitəsilə təyin edilmişdir.

Qruplarda göstərilən variasion sıraya düzülmüş və hər bir variasion sıra üçün orta hesabi göstərici (M), bu göstəricinin standart xətası (m), minimal (min), maksimal (max) qiymətləri hesablanmışdır.

Bununla yanaşı, tədqiqat işinə daxil etdiyimiz bioloji markerlərin ROC analizi vasitəsilə spesifikliyi və həssaslığı öyrənilmişdir. Referent göstəricilər ROC əyrisində $L_{(0,1)}=\sqrt{(1\text{-spesifiklik, SP})^2+(1\text{-həssaslıq, SE})^2}$ düsturu əsasında əks olunub.

**Tədqiqatın nəticələri və onların müzakirəsi**: Qan serumunda İL-6, TNF-α və FABP-ın səviyyəsi müəyyən edilmiş və nəticələr müqayisəli analiz edilmişdir (cədvəl 1).

**Cədvəl 1. Kontrol qrupunun və xəstələrin qan serumunda İL-6, TNF-α və FABP-ın konsentrasiyası (M±m).**

| Göstəricilər / Qruplar | İl-6 (pq/ml) | TNF-α | FABP (pq/ml) |
|---|---|---|---|
| Kontrol | 1,3±0,3 | 1,7±0,7 | 13,6±0,6 |
| Bədxassəli kolorektal xərçəng | 13,9±5,8** | 6,1±1,3* | 6,4±1,2* |
| Metastatik kolorektal xərçəng | 6,5 ±0,5** | 12,0±2,3** | 3,3 ±0,6** |
| Adenomatoz polip | 13,6±2,9** | 2,4±0,8 | 19,4±1,8* |

Qeyd: kontrol qrupunun göstəricisi ilə fərqin statistik dürüstlüyü - *p<0,05; **p<0,001

Alınmış nəticələrdən məlum olur ki, tədqiqat olyektinə daxil edilən xəstələrin qanında İL-6 ən çox bədxassəli kolorektal xərçəng və adenomatoz polipolan xəstələrdə artır. Bütün tədqiqatımızda, bu göstərici bədxassəli Kolorektal xərçəngolan xəstələrin qanında, xoşxassəli şişlərə nisbətən 4,5 dəfə, metastatik Kolorektal xərçəngolanlara nisbətən 2,1 dəfə yüksək olmuşdur. Adenomatoz polipli xəstələrdə İL-6 xoşxassəli kolorektal xərçəngndəkinə nisbətən 4,4 dəfə yüksəkdir. Deməli, əgər qan serumunda İL-6-nın səviyyəsi kontrol qrupdan xeyli yüksəkdirsə, belə xəstələrdə xoşxassəli kolorektal xərçəngni inkar etmək lazımdır. İl-6 şiş toxumasını aktivləşdirməklə, rezorbsiya proseslərini sürətləndirir (Bradley, 2006: 149). Məlumdur ki, adenomatoz polip kimi kolorektal xərçəng də əsasən uşaq və gənc yaşlarda inkişaf edir. Bu xəstəliklərin ilkin əlamətləri demək olar ki, bir-birinə oxşar olur. Bu halda daha ixtisaslı müəssisələrdə bədxassəli kolorektal xərçəng və adenomatoz polip xəstəlikləri ətraflı araşdırılmalı və müvafiq dianoz təsdiq edilməlidir.

Qəbul edilmiş standart müayinə metodları ilə yanaşı, qan serumunda İL-6-nın analizi prosesin bəd-yaxud xoşxassəli təbiətə malik olduğu barədə həkimə məlumat verir. Bu da xəstələrin vaxtında və adekvat müalicə qəbul etməsinə kömək edir.

İL-6 və TNF-α-nın ROC əyrisinin statistik göstəriciləri 1-ci şəkildə əks edlib.




**Şəkil 1. İL-6 və TNF-α-nın ROC əyrisinin statistik nəticələri (ROC curve - ROC əyrisi, specificity - spesifiklik, sensetivity - həssaslıq, reference line - referent xətti)**

İL-6-nin ROC əyrisinin 95%-lik etibarlılıq intervalına əsasən aşağı sərhəddi 0,737; yuxarı sərhəddi isə 0,924 və əyri altında qalan sahə isə 0,831 təşkil edir.

TNF- α-nin ROC əyrisinin 95%-lik etibarlılıq intervalına əsasən aşağı sərhəddi 0,498; yuxarı sərhəddi isə 0,774 və əyri altında qalan sahə isə 0,636 təşkil edir.

Məlumdur ki, ideal testdə ROC əyrisi qrafikin sol yuxarı küncündə yerləşir, bu zaman həqiqi müsbət nəticələr 100% olur. Uyğun olaraq testin əyrisi nə qədər aşağıda olarsa, testin keyfiyyəti bir o qədər yüksək olur. Qrafik x=y düz xətti ilə tamamlanır. Belə ki, əgər ROC xətti y=x bərabərliyindən aşağı yerləşibsə, həmin test keyfiyyətsiz hesab edilir. İL-6-nın ROC əyrisindən də göründüyü kimi, bu test yüksək həssaslığa və spesifikliyə malik olan əhəmiyyətli müayinə metodudur.

TNF-α çoxfunksiyalı sitokindir və əsas etibarı ilə makrofaqlarda və eyni zamanda neyroqliya hüceyrələrində, mastositlərdə, endotelial hüceyrələrdə, LAK (limfokin aktivləşdirilmiş killerlər) və təbii killerlərdə sintez edilir. Sağlam insanın qanında TNF-α demək olar ki, yoxdur (Sharom, 2011: 161).

TNF-α-nın səviyyəsi bədxassəli, xüsusilə metastatik kolorektal xərçəng olan xəstələrin qanında daha yüksək olur. Bu baxımdan TNF-α-nın analizi diferensial diaqnostikada əhəmiyyətli rol oynaya bilər (Loo, 2001: 36877). Bədxassəli kolorektal xərçəng olan xəstələrdə bu göstəricinin səviyyəsi xoşxassəli kolorektal xərçəng olanlara nisbətən 3 dəfə, adenomatoz polipolanlardakından isə 2,5 dəfə yüksək olur (Zidi, 2010: 185). Metastatik kolorektal xərçəng zamanı bu fərq daha böyük rəqəmlərlə xarakterizə edilir, metastatik kolorektal xərçəng olan xəstələrdə xoşxassəli kolorektal xərçəng olanlara nisbətən 6 dəfə, adenomatoz polipdən 5 dəfə, bədxassəli kolorektal xərçəng olanlardan 2 dəfə yüksək olur.

Tədqiqat kontingentinə daxil edilmiş xəstələrdən 43 nəfərdə TNF-α-nın göstəriciləri normadan yüksək olmuş, 32 xəstədə dəyişilməmişdir. 22 xəstədə bu göstərici yoxlanılmamışdır. Bu rəqəmlərin əsasında alınmış ROC əyrisinə əsasən, qeyd etmək olar ki, TNF-α-nı diaqnostik dəyəri yüksək olan test hesab etməklə, kolorektal xərçəngnin diaqnostikasında və diferensial diaqnostikasında geniş tətbiq etmək olar (Oswald, 2006: 385).

Tədqiqat işimizdə antimikrob peptidlərdən FABP-nin kolorektal xərçəngnin və adenomatoz polipin diferensial diaqnostikasında vacib rol oynaması istiqamətində nəticələr əldə etmişik. Əldə etdiyimiz nəticələrdən belə məlum olur ki, FABP-nin səviyyəsi yalnız adenomatoz polip zamanı kontrol qrupa nisbətən yüksəlir, bu göstəricinin səviyyəsi adenomatoz polip zamanı kontrol qrupa nisbətən 1,4 dəfə ($p<0,01$) yüksək olmuşdur. Kolorektal xərçəng olanlarda isə FABP-nin səviyyəsi kontrol qrupa nisbətən azalır. Belə ki, xoşxassəli kolorektal xərçəng olan xəstələrdə FABP səviyyəsi kontrol qrupa nisbətən 1,6 dəfə, adenomatoz polipli xəstələrin qrupundakına nisbətən 2,3 dəfə azalır. Bədxassəli kolorektal xərçəng olan xəstələrdə FABP səviyyəsi poliplilərə nisbətən 3 dəfə, kontrol qrupdakına nisbətən 2,1 dəfə, xoşxassəli kolorektal xərçəng olan xəstələrdəkinə nisbətən 1,3 dəfə azdır.

Deməli, xəstədə bədxassəli bağırsaq şişini adenomatoz polipdən fərqləndirməkdə çətinlik yarandıqda diferensial diaqnoz üçün qanda FABP immunoferment üsulla müayinəsinin aparılması vacib diaqnostik əhəmiyyət kəsb edə bilər (Berejnya, 2009: 86). Bu göstəricinin səviyyəsinin normadan xeyli aşağı olması Kolorektal xərçəngüçün səciyyəvi hesab edilə bilər. FABP qara-ciyərdə çoxluq təşkil edir. Lakin bağırsaq divarında, mədəaltı vəzidə, böyrəkdə, ağciyərdə və mədənin selikli qişasında sintez edilir. FABP hepatositlərdəki proteinlərin 5%-ni təşkil edir. Bu protein piy turşusunu özünə birləşdirməklə yanaşı, koenzim A-nı, elkozanoidləri, karsinogenləri də özünə birləşdirişdirir. Tədqiqatın nəticələrinə görə, metastatik kolorektal xərçəng zamanı FABP-nin səviyyəsinin polipli xəstələrindəkinə nisbətən 5,8 dəfə, kontrol göstəricilərə nisbətən 4,1 dəfə, xoxassəli Kolorektal xərçəngolanlara nisbətən 2,5 dəfə, bədxassəli Kolorektal xərçəngolan xəstələrdəkinə nisbətən 1,9 dəfə azdır. Beləliklə, hesab edirik ki, FABP-dan kolorektal xərçəngnin skrinin müayinəsi üçün istifadə edilməsi məqsədəuyğundur.

FABP-ın ROC əyrisinin statistik göstəriciləri 2-ci şəkildə əks olunmuşdur.




**Şəkil 2. FABP-nın (piy turşusunu birləşdirən protein) ROC əyrisinin statistik nəticələri (ROC curve - ROC əyrisi, specificity - spesifiklik, sensetivity - həssaslıq, reference line – referent xətti)**

FABP-nin ROC əyrisinin 95%-lik etibarlılıq intervalına əsasən aşağı sərhəddi 0,781; yuxarı sərhəddi isə 0,948 və əyri altında qalan sahə isə 0,864 təşkil edir.

Tədqiq etdiyimiz xəstələrdən 38 nəfərdə FABP-nin nəticələri müsbət, 32 nəfərdə mənfi olmuşdur. 27 xəstədə bu müayinə aparılmamışdır. FABP-nin ROC əyrisi y=x düz xəttindən aşağı yerləşmiş, AUC sahəsi az olmuşdur. Deməli, bizim aldığımız nəticələr əsasında FABP statistik olaraq diaqnostik dəyəri az olan test kimi qiymətləndirilmişdir.

## Nəticə

Tədqiqat işindən alınmış parametrlərdən məlum olur ki, Kolorektal xərçəng və adenomatoz polipin diferensial diaqnostikası üçün ümumi qəbul edilmiş müayinə vasitələri ilə yanaşı, qan serumunda İL-6, TNF-α və FABP analizi vacibdir. Bu müayinələrin nəticələri müalicə həkiminə xəstəliyin xarakteri barəsində məlumat verməklə, vaxtında və dəqiq diaqnoz qoymağa imkan verir.

## Ədəbiyyat

1. Burke, F., Relf, M., Negus, R., Balkwill, F. (1996). A cytokine profile of normal and malignant ovary. Cytokine. Vol. 8, pp.578-585.
2. Akdis, M. (2011). Interleukins, from 1 to 37, and interferon-γ: receptors, functions, and roles in disease. Journal of Allergy and Clinical Immunology, Vol.127, 128739, pp.701-8.
3. Anjali, S., Sebastien, A., David, W. (2011). A rare case of calcitonin and carcinoembryonic antigen negative medullary colorectal cancer. Endocrine Abstracts. № 25, pp.182-9.
4. Atsumi,T., Singh, R., Sabharwal, L. (2014). Inflammation amplifier, a new paradigm in cancer biology. Cancer Res. № 74, pp.8-14.
5. Balkwill, F. (2009). Tumour necrosis factor and cancer. Nature Reviews Cancer. № 9(5), pp.361-71.

6. Barbet, J., Campion, L., Kraeber-Bodere, F. (2005). Prognostic impact of serum calcitonin and carcinoembryonic antigen doubling-times in patients with medullary thyroid carcinoma. J Clin Endocrinol Metab. № 90, pp.6077-6084.
7. Bradley, J.R. (2008). TNF-mediated inflammatory disease. J. Pathol., v. 214, pp.149-160.
8. Sharom, F.J. (2011). "The P-glycoprotein multidrug transporter". Essays in Biochemistry, Vol. 50. № 1, pp.161-178.
9. Loo, T.W., Clarke, D.M. (2001). "Determining the dimensions of the drug-binding domain of human p-glycoprotein using thiol cross-linking compounds as molecular rulers". Journal of Biological Chemistry, Vol. 276. № 40, pp.36877-36880.
10. Zidi, I., Mestiri, S., Bartegi, A., Amor, N.B. (2010). TNF-alpha and its inhibitors in cancer. Med Oncol. Vol. 27, pp.185-198.
11. Oswald, C., Holland, I.B., Schmitt, L. (2006). "The motor domains of ABC-transporters: what can structures tell us?" Naunyn-Schmiedeberg's Archives of Pharmacology. Vol. 372. № 6, pp.385-399.
12. Berezhnya, N.M. (2009). Rol kletok sistemi immuniteta v mikrookruzhenyy opukholi. Vzaimodeystvie kletok sistemy immuniteta s drugimi komponentami mikrooruzzheniya. Onkologiya, Vol. 11. № 2, s.86-93.

Göndərilib: 20.11.2023 Qəbul edilib: 29.12.2023

DOI: https://doi.org/10.36719/2707-1146/40/13-17

**Shahla Asgarova**
Azerbaijan Medical University
dr.shahla@mail.ru
**Parvana Mahmudova**
Azerbaijan Medical University
mahmudova@mail.ru
**Sevda Alasgerova**
Azerbaijan Medical University
dr.seva@mail.ru
**Jala Zeynalova**
Azerbaijan Medical University
djale@mail.ru

# ORAL HEALTH CONDITIONS OF WOMEN DURING PREGNANCY

## Abstract

Pregnancy is a period in which many hormonal changes occur in the woman's body and, accordingly, many local and systemic changes occur. Increased hormonal secretion and growth of the fetus trigger some systemic and local physiological and physical changes. Local physical changes can be observed in various parts of the body, the oral cavity being one of them. The effect of various factors in this regard has been studied in this article. During different periods of pregnancy, different situations that arise in the oral cavity are reflected.

***Keywords:*** *pregnancy, oral cavity, clinical longevity, hormonal changes, prophylactic measures, plaque, bacteria*

**Şəhla Əsgərova**
Azərbaycan Tibb Universiteti
dr.shahla@mail.ru
**Pərvanə Mahmudova**
Azərbaycan Tibb Universiteti
mahmudova@mail.ru
**Sevda Ələsgərova**
Azərbaycan Tibb Universiteti
dr.seva@mail.ru
**Jalə Zeynalova**
Azərbaycan Tibb Universiteti
djale@mail.ru

# Hamiləlik dövründə ağız boşluğunun vəziyyəti

## Xülasə

Hamiləlik qadın orqanizmində bir çox hormonal dəyişikliklərin baş verdiyi və buna uyğun olaraq bir çox yerli və sistemli dəyişikliklərin baş verdiyi bir dövrdür. Hormonal ifrazatın artması, dölün böyüməsi bəzi sistemli və yerli fizioloji və fiziki dəyişikliklərə səbəb olur. Bədənin müxtəlif yerlərində yerli fiziki dəyişikliklər müşahidə oluna bilər ki, bunlardan biri də ağız boşluğudur. Məqalədə bununla bağlı olaraq müxtəlif faktorların təsiri araşdırılıb. Hamiləliyin müxtəlif dövrləri zamanı ağız boşluğunda yaranan müxtəlif vəziyyətlər öz əksini tapır.

***Açar sözlər:*** *hamiləlik, ağız boşluğu, klinik uzunömürlülük, hormonal dəyişikliklər, profilaktik tədbirlər, ərp, bakteriya*

## Introduction

The increase in hormonal secretion during pregnancy and the increase in the secretion of estrogen and progesterone hormones are emphasized. Due to such hormonal changes, during pregnancy, the mother develops an inflammatory response to the bacterial plaque tissue on the teeth and gums, and the gums become more sensitive, especially if the mother's care is inadequate. In this condition called "pregnancy gingivitis", the gums appear red, swollen and bleed easily, accompanied by bad breath. If the mother's oral care is not sufficient before pregnancy, this situation may be more severe. Another gum disease that may occur during this period is "pregnancy tumor". The causes of pregnancy tumor are increased hormonal secretions as well as inadequate oral hygiene, as in pregnancy gingivitis. Surgical intervention is rarely needed in its treatment, the disease is usually monitored by a physician during pregnancy and heals spontaneously after birth. If a pregnancy tumor causes a lot of discomfort to the mother, it can be removed by the doctor in the second trimester of pregnancy (Murtomaa, 2016: 115).

Regardless of hormonal changes, one of the health problems that we may encounter during pregnancy is "erosion". Vomiting, which occurs in the early stages of pregnancy, makes the oral environment acidic, causing weakening and erosion of dental tissues.

Toothache During Pregnancy:

Treatments that can be performed during pregnancy differ in each trimester. These;

First trimester:

In the first three months of pregnancy, the baby's organs are in the development phase (Petersen, 2005: 71-74). A bacteremia caused at this stage may negatively affect the baby's organ development, and unnecessary interventions may cause miscarriage. However, in cases where teeth that cause pain and/or may cause more damage if left untreated require urgent treatment, such as extraction or root canal treatment, one should go to the dentist without hesitation. In emergency situations such as toothache or gum infection, it should be taken into consideration that the existing infection may affect the baby's development more than the negative effects of dental treatment. The dentist will apply a treatment that does not harm the baby, in line with the recommendations of the gynecologist (Turkish Dental Association, 2020).

Second trimester:

In the first three months of pregnancy, adequate tooth brushing and oral care cannot be done due to nausea and vomiting. This situation negatively affects tooth and gum health. In order to reduce these negative effects in the second trimester and to protect the health of teeth and gums throughout the pregnancy, a simple dental cleaning should be performed. In addition, during this period, tooth extractions, fillings, root canal treatments, etc., which are not appropriate to be postponed until the end of pregnancy (Karabekiroglu, Unlu, 2017: 89-100). This is the most suitable period for many treatments.

Third trimester:

During this period, the baby has grown considerably in the womb and birth is approaching. The mother cannot sit comfortably in the chair and excessive stress may cause premature birth. Just like in the first trimester, the dentist will not intervene except for emergency treatments (Mutluay, Mutluay, 2019: 175-81).

During pregnancy, gum disease called pregnancy gingivitis is most common in the gums due to the imbalance in estrogen and progesterone hormones. In the early stages of pregnancy, swelling and redness of the gums may be observed. This type of gum is very sensitive and bleeds easily (Fitzsimons, Dwyer, Palmer, Boyd,1998:182-188). Pregnancy gingivitis usually begins in the 2nd month of pregnancy, reaches its peak in the 8th month, and subsides after birth.

Factors such as bacterial plaque or tartar, which form in people who do not perform regular oral and dental care and cause gum infection, can take pregnancy gingivitis to more serious levels (Hartnett, Haber, Krainovich-Miller, Bella, Vasilyeva, Kessler, 2016: 565-573).

Studies have reported that untreated maternal gestational gingivitis leads to the birth of a low-birth-weight baby. As with other dental treatments, scaling should be done especially in the second trimester of pregnancy.

The baby's dental development begins in the womb. During this period, the mother should pay attention to a balanced diet for both her own health and her baby's dental development. Protein for dental health, vitamin C (meat, milk, eggs, yellow vegetables and fruits), vitamin C (citrus fruits, tomatoes, strawberries), vitamin D (meat, milk, eggs, fish) and calcium (milk and dairy products, green leafy vegetables). Foods rich in) should be taken in sufficient amounts. In addition, unconscious drug use should be avoided. The medications used may negatively affect the baby's dental health as well as his general body development. Being knowledgeable about your baby's dental health is the first step in ensuring your child has healthy teeth for a lifetime. Learn about baby's dental care and nutrition.

**Result.** In order to minimize the risk of encountering dental and gum diseases during pregnancy, the mother must pay great attention to oral hygiene. During this period, some expectant mothers state that they are much more sensitive to smells and similar stimuli, and may experience nausea even during a simple procedure such as brushing their teeth (Bertness, Holt, 2017). However, the most important point to know is that it is not possible for the dentist to apply all kinds of treatment to the expectant mother at every period during pregnancy. For this reason, expectant mothers have to pay more attention to their oral and dental health than ever before.

Daily oral care should be done more carefully, teeth should be brushed at least twice a day and dental floss should be used. In this way, the "bacterial plaque" that causes tooth and gum diseases is removed from the oral environment. Apart from these, care can be strengthened with non-alcoholic mouthwashes, and if non-alcoholic mouthwash is not available, gargle with warm salt water to relieve the sensitivity of the gums (Oral Health Care During Pregnancy: A National Consensus Statement, 2012; The National Maternal and Child Oral Health Resource Center, 2012; Turkish Dental Association, 2020).

It is important to have regular dentist check-ups during this period in order to ensure effective plaque control and to prevent possible diseases early.

A diet rich in vitamins and minerals for the expectant mother is among the factors that support the oral and dental health of both the mother and the baby.

In planned pregnancies, it is very beneficial to have a dentist check-up beforehand, to detect problems that may be encountered in the future, and to complete the treatments, if any, before pregnancy. In this way, the desired maximum oral hygiene is achieved (Kaydirak, Shahin, Can, Koray, 2018: 11-16).

Laser Dental Treatment During Pregnancy: Laser tooth preparation before filling (decay removal), Root canal treatment, Gum treatments, Curettage (deep gum cleaning), Removal of soft tissue lesions, Canker sores and herpes treatments, which can be applied to all situations and all age groups, including children, pregnant women, heart patients, Treatment of tooth sensitivities (closing dentin canals), Surgical treatments (such as wisdom teeth, implants, mouth and jaw surgeries), Biostimulation (preventing pain after surgery) treatments can generally be performed without the need for anesthesia. Since laser provides 100% disinfection and sterilization with its strong bactericidal effect in the area where it is applied, it eliminates the risks of re-infection and the onset of caries. The laser has no known side effects. Laser application is not only applied to cancerous tissues. Patients and employees must wear protective glasses during laser applications.

Use of local anesthesia during pregnancy: Local anesthesia can be applied during pregnancy because it reduces stress by preventing pain during treatment. However, care should be taken when choosing a local anesthetic agent during pregnancy.

Local anesthetics containing Octopressin can cause premature birth by causing contraction of the uterus.

This type of local anesthetic should not be preferred during pregnancy.

Dental x-ray during pregnancy: It is not recommended to take x-rays as the baby's organ outlines develop in the first 3 months. There is no harm in taking x-rays in later periods. In this regard, you need to have a photoshoot after consulting your gynecologist. If an x-ray is absolutely necessary for emergency treatment, the expectant mother should wear a special protective lead apron and a low dose should be applied (Agueda, Echeverria, Manau, 2008: 609-15).

Drug use during pregnancy: Paracetamol type painkillers are generally used safely during pregnancy. Care should be taken when using painkillers and the recommendations of your gynecologist should be strictly followed. If antibiotic use is necessary, the use of antibiotics such as penicillin derivatives (amokicillin, etc.) has no harm for the baby. Tetracycline group antibiotics should not be used. If tetracycline is taken during pregnancy, it causes "tetracycline discoloration" on the baby's teeth (Dellinger, Livingston, 2006: 677-97).

Nutrition during pregnancy is very important for the general health and oral health of both the mother and the baby. During pregnancy, the baby's tooth development begins in the 5th and 6th weeks.

In terms of oral and dental health, during the entire pregnancy period: fruits and vegetables rich in vitamins A, C, D, phosphorus and calcium, grains, milk and dairy products, meat, fish and eggs should be consumed in a balanced manner. If adequate oral and dental care is provided along with a good diet, no different teeth and gum problems will be encountered during pregnancy than in the normal period.

Therefore, daily oral and dental care should not be interrupted. Because there is a direct relationship between plaque accumulation, gum diseases and hormonal changes that occur during pregnancy. The increase in hormones that occurs during pregnancy causes the oral mucosa to become sensitive to external factors, especially bacterial plaques.

## Conclusion

Before planning a pregnancy, we should consult with a gynecologist and plan, as well as go to the dentist and solve the problems related to our problematic teeth and gums, and also have radiological examinations done to identify teeth that may cause problems and take precautions in advance. In this way, you can have a problem-free and stress-free pregnancy in terms of dental health.

## References

1. Murtomaa, H. (2016). Better oral health to all. Journal of Contemporary Medical Sciences. Vol.2(8), 115 p.
2. Petersen, P.E. (2005). Priorities for research for oral health in the 21st Century – the approach of the WHO Global Oral Health Programme. Community Dental Health, 22, pp.71-74.
3. Turkish Dental Association. 07.07.2020.
4. Karabekiroglu, S., Unlu, N. (2017). The place and importance of early preventive practices in community-based preventive oral and dental health programs. EU Dishek Fak Derg. Vol.38 (2), pp.89-100.
5. Mutluay, A.T., Mutluay, M. (2019). Preventing early childhood caries by educating the mother and improving oral health in preventive oral health programs. Turkish Clinics J Dental Sci. Vol. 25(2), pp.175-81. DOI: 10.5336/dentalsci.2017-57401.
6. Fitzsimons, D., Dwyer, J.T., Palmer, C., Boyd, L.D. (1998). Nutrition and oral health guidelines for pregnant women, infants, and children. Journal of the American Dietetic Association. Vol.98 (2), pp.182-188.
7. Hartnett, E., Haber, J., Krainovich-Miller, B., Bella, A., Vasilyeva, A., Kessler, J.L. (2016). Oral Health in Pregnancy, JOOGN, Vol.45(4), pp.565-573.
8. Bertness, J., Holt, K. (2017). Oral Health Care During Pregnancy: A Resource Guide. 2nd ed. Washington, D.C.

9. Oral Health Care During Pregnancy: A National Consensus Statement. (2012). The National Maternal and Child Oral Health Resource Center, Georgetown University. Washington, D.C, 2012. 07.07.2020.
10. Kaydirak, M.M., Shahin, N.H., Can, M.M., Koray, M. (2018). Pregnant women's knowledge and opinions about oral and dental health. Journal of Health Sciences. Vol.9(3), pp.1-16. DOI: 10.22312/sdusbed.423781.
11. Agueda, A., Echeverria, A., Manau, C. (2008). Association between periodontitis in pregnancy and preterm or low birth weight. Review of the literature, pp.609-15.
12. Dellinger, T.M., Livingston, H.M. (2006). Pregnancy: Physiological changes and considerations for dental patients. Dent Clin N Am. Vol.50, pp.677-97.

Received: 26.11.2023 Accepted: 03.01.2024

## BİOLOGİYA ELMLƏRİ VƏ AQRAR ELMLƏR

## BIOLOGICAL SCIENCES AND AGRARIAN SCIENCES

DOI: https://doi.org/10.36719/2707-1146/40/18-23

**Elşad Qurbanov**
Bakı Dövlət Universiteti
biologiya elmləri doktoru
prof.elshad_g@rambler.ru
**Sənubər Aslanova**
Azərbaycan Dövlət Pedoqoji Universiteti
biologiya üzrə fəlsəfə doktoru
aslanova17.02@mail.ru
**Şahin İbrahimov**
Bakı Dövlət Universiteti
doktorant
shahin.ibrahimov@socar.az

# ŞİRVAN RAYONUNUN NEFTLƏ ÇİRKLƏNMİŞ TORPAQLARINDA RAST GƏLİNƏN YARIMSƏHRA BİTKİLİYİNİN FİTOEKOLOJİ XARAKTERİSTİKASI

**Xülasə**

Əhalinin sağlamlığının, ərzaq təhlükəsizliyinin təmin olunmasında ətraf mühitin, ekologiyanın çox mühüm rolu nəzərə alınaraq ekoloji tarazlığın qorunması yönündə ölkəmizdə ardıcıl və səmərəli dövlət siyasəti həyata keçirilir. Ətraf mühitin çirklənməsinin minimuma endirilməsi, ekoloji vəziyyətin yaxşılaşdırılması və mühafizəsi dövlətimizin bu yöndə siyasətinin əsas istiqamətlərindəndir. Müasir dövrdə neft məhsulları çıxarıldıqda antropogen və texnogen təsirlərdən torpaqlar deqradasiya prosesinə məruz qalır və floramızda olan bəzi növlər sıxışdırılır. Azərbaycan Respublikası Dövlət Neft Şirkətinin "Şirvan Neft" Neft-Qaz çıxarma İdarəsi (NQÇİ) Pirallahı neft mədənində Xam neftlə, mazutla və laysuları ilə çirklənmiş torpaqlarında ilk dəfə tərəfimizdən aparılmış fitoekoloji, yaxud ekoloji-geobotaniki tədqiqatlarda əsasən çirklənmiş bitki örtüyünün növ tərkibi və quruluşunun öyrənilməsi aktuallığa malikdir.

Müasir dövrdə ölkəmizdə neftlə çirklənmiş torpaqlarda fitoekoloji tədqiqatlar və araşdırmaların aparılması ən aktual ekoloji problemlərdəndir. Odur ki, Şirvan rayonu ərazisindəki “Şirvan Neft”in mədənlərində torpaq kəsimləri götürülərkən, çirklənmiş ərazilərdə fitosenozların növ tərkibi müəyyənləşdirilmişdir. Aparılan elmi-tədqiqat işlərində seçilmiş nümunə və sahələrdə (neft quyularının ətrafında) yayılan yarımsəhra tipli formasiyaların növ tərkibi və quruluşu öyrənilmişdir. Ərazidə rast gəlinən təmiz və mazuta (neft məhsulları ilə) bulaşmış bitkilər herbariləşdirilmiş, növlərin adı dəqiqləşdirilmişdir. Aparılan fitoekoloji tədqiqatların nəticələri “Bitki örtüyünün təsnifatı”nda istifadə edilmişdir. Belə ki, “Şirvan Neft”in neftlə çirklənmiş torpaqlarında qeydə alınmış yarımsəhra bitkiliyi 1 formasiya qrupuna aid 1 assosiyasiyada təsnif olunmuşdur.

***Açar sözlər:*** *fitosenoz, assosiasiya, formasiya qrupu, mezokserofit, fitotoksik*

**Elshad Gurbanov**
Baku State University
doctorate of biological sciences
prof.elshad_g@rambler.ru
**Sanubar Aslanova**
Azerbaijan State Pedagogical University
PhD in biology
aslanova17.02@mail.ru

**Shahin Ibrahimov**
Baku State University
PhD student
shahin.ibrahimov@socar.az

# Phytoecological characteristices of semi-desert vegetation found in oil-polluted soils of Shirvan district

## Abstract

Taking into account the very important role of the environment and ecology in ensuring the health and food safety of the population, a consistent and efficient state policy is implemented in our country in the direction of protecting the ecological balance. Minimization of environmental pollution, improvement and protection of the ecological situation are the main directions of our state's policy in this direction. In modern times, when oil products are extracted, due to anthropogenic and technogenic effects, soils are subjected to the degradation process and some species of our flora are suppressed. In the phytoecological or ecological-geobotanical studies conducted by us for the first time in the soils polluted by crude oil, fuel oil and lysates in the Pirallahi oil field of the State Oil Company of the Republic of Azerbaijan "Shirvan Neft" Oil and Gas Extraction Department (NGCI), it is important to study the species composition and structure of the contaminated vegetation.

Nowadays phytoecological studies and investigations on oil-contaminated soils are one of the most urgent environmental problems in our country. Therefore, while taking soil samples in the mines of "Shirvan Neft" in the territory of Shirvan region, the species composition of phytocenoses in the polluted areas was determined. The species composition and structure of the semi-desert type formations spread in the selected samples and areas (around the oil wells) were studied in the conducted scientific-research works. The clean plants and those contaminated with fuel oil (oil products) found in the area were herbarium, and the names of the species were specified. The results of the conducted phytoecological studies were used in "Vegetation Classification". Thus, the semi-desert vegetation recorded in the oil-contaminated lands of "Shirvan Neft" was classified in 1 association belonging to 1 formation group.

***Keywords:*** *phytocenosis, association, formation group, mesoxerophyte, phytotoxic*

## Giriş

Yer kürəsində insan sağlamlığının qorunması qlobal problemlərdən biridir. Antropogen təsirlər nəticəsində ətraf mühitin çirklənməsinin qarşısının alınması üçün kompleks tədbirlər görülməlidir.

Belə tədbirlərdən biri də Azərbaycanda fəaliyyət göstərən və göstərməyən neft və qazçıxarma idarələrində ərazilərin neft, neft tullantıları və lay suları ilə çirklənmiş torpaqların həmin çirkləndiricilərdən təmizlənməsi və rekultivasiyası həyata keçirilməlidir. Bu məqsədlə Azərbaycan Respublikası "Şirvan Neft" idarəsinin mədənlərində müasir vəziyyət öyrənilmiş, fitoekoloji xüsusiyyətləri öyrənmək üçün elmi tədqiqat işləri yerinə yetirilmişdir. Ərazidə rekultivasiya işləri aparmaq üçün neft və neft məhsulları ilə çirklənmiş sahələrin bitkilik aləmi öyrənilmişdir.

**Material və metodlar.**

Azərbaycan Respublikasının ərazisində texnogen pozulmuş torpaqlara aid neftlə çirklənmiş sahələr 12 min hektar. "Azneft birliyi"nin "Salyanneft"-4325,0 ha və "Neftçalaneft"-176,6 ha, həmçinin Abşeron yarımadasında neftlə çirklənmiş "Abşeronneft" və digər mədənlərdə neftlə çirklənmiş torpaqlar 21,3 min ha təşkil edir; bunlar 10,1 min hektar lay suları ilə çirklənmişdir (Azərbaycan Respublikası Ekoloji Atlası, 2009: 82; Aslanova, İbrahimov, 2023; Gurbanov, Rzaeva, 2019).

Aparılan fitoekoloji tədqiqatların nəticələri "Bitki örtüyünün təsnifatı"nda istifadə edilmişdir. Belə ki, "Şirvan Neft"in neftlə çirklənmiş torpaqlarında qedə alınmış bitkiliyi yarımsəhra bitkilik tipi, 1 formasiya qrupuna aid 1 assosiyasiyada təsnif olunmuşdur (Kurbanov, Aslanova, Ibragimov,

2023; Siyəzən yerquruluşu planı, 2010; Qurbanov, Cabbarov, 2017: 214; Cerepanov, 1995: 992; Gurbanov, Huseynova 2022; Aslanova, 2023; Aslanova, İbrahimov, 2023).

**“Şirvan Neft”in neftlə çirklənmiş bitki örtüyünün təsnifatı:**

**I. Yarımsəhra (*Hemideserta*) bitkilik tipi.**

1. Yovşanlı – qarağanlıq (*Artemisietun-salsalosum*) formasiya qrupu.

2. Ətirli yovşanlı – ağacvari, şoranqəliyi (*Artemisietun lerchiana-Salsolosum dendroides*) assosiasiyası.

**İşin gedişatı və əldə olunmuş nəticələr:**

**II. Yarımsəhra bitkilik ipi.**

**2.1.** Yovşanlı-qarağanlıq **(***Artemisietum Salsolosum***)** fosmasiya qrupu.

Bu formasiyanın bitki örtüyü “Şirvan Neft” in 2 №-li mədənin yerləşdiyi neft quyusunun ətrafında yayılır (Fitoekoloji təsvir 1).

Fitosenozun tərkibində 16 növə təsadüf edilir; bundan 2 növ (12,5%) kollar, 1 növ (6,3%) yarımkol, 1 növ (6,3%) kolcuq, 6 növ (37,5%) çoxillik, 2 növ (12,4%) ikiillik və 4 növ (25,0%) birillik otlardır (Hacıyev, Qasımov, 2008: 272; Qurbanov, Aslanova, İbrahimov, 2023; Qurbanov, Aslanova, Asadova, 2023). Ekoloji təhlilə əsasən həmin növlərdən 6 növ (37,5%) kserofitlər, 7 növ (43,8%) mezokserofitlər, 2 növ (12,4%) mezofitlər və 1 növ (6,3%) halofitlərə aiddir (Gurbanov, Aslanova, İbrahimov, 2023; Gurbanov, Aslanova, 2023; Kuijper, Dubbeld, Bakker, 2005).

Formasiyanın dominantı qarağanın– (*Salsola dendroides*) bolluğu 3-4 bal və subdominantı ətirli yovşanın (*Artemisia lerchiana*) bolluğu 2 baldır.

Quruluşuna görə fitosenozun I mərtəbəsində çoxbudaqlı yulğun (*Tamarix ramosissima*)**,** şober şorgiləsi (*Nitraria shoberi*); II mərtəbisndə - ağacvari şorangə (*S. dendroides*), kövrək şorangə (*S. ericoides*), Meyer dəvəayağı (*Limonium meyeri*); III mərtəbəsində - Ətirli yovşan (*A. lerchiana*), şərq bozağı (*Eremopyrum orientale*), budaqlı qışotu (*Petrosimonia brachiata*) və s. birillik otlar rast gəlinir (Yaqubov, 2003; Qurbanov, Rzaeva, 2019; Qurbanova, Asadova, 2018; Aslanova, İbrahimov, 2023; Qurbanov, Aslanova, 2023).

Ümumi layihə örtüyü 30-50%-ə bərabərdir. Bitki örtüyü yayıldığı torpaqlar neftlə zəif dərəcədə çirklənmişdir (Aslanova 2023; Qurbanov, İbrahimov 2023; Qurbanov, Aslanova, İbrahomov, 2023).

**Fitoekoloji təsvir – 1.**
**“Şirvan Neft” NQÇİ-nin 2 №-li neft mədənində yovşanlı-qarağanlıq (*Artemisietum-Salsolosum*) formasiyasının növ tərkibi (22.06.2023-cü il).**

| № | Biomorf növlər | Ekoloji qruplar | Bolluğu (bal ilə) | Mərtəbəlik və hündürlük (sm-lə) | Fenoloji fazaları |
|---|---|---|---|---|---|
| **1** | **2** | **3** | **4** | **5** | **6** |
| **1.** | **Kollar**<br>*Tamarix ramosissima* Ledeb. | Mezokserofit | 1-2 | I (200) | çiç. |
| **2.** | *Nitraria schoberi* L. | Kserofit | 1 | I (130) | çiç. |
| **3.** | **Yarımkollar**<br>*Salsola dendroides* Pall. | Mezokserofit | 3-4 | II (60) | veq. |
| **4.** | **Kolcuqlar**<br>*Salsola ericiodes* Bieb. | Kserofit | 1-2 | II (45) | veq. |
| **5.** | *Artemisia lerchiana* Web. | Kserofit | 2 | III (30) | veq. |
| **6.** | *Limonium meyeri* (Boiss.) O.Kuntze | Kserofit | 1-2 | II (50) | çiç. |
| **7.** | *Medicago caerulea* Less.& Ledeb. | Mezofit | 1-2 | II (35) | çiç. |
| **8.** | *Alhagi pseudalhagi* (Bieb.) Fisch. | Mezokserofit | 1 | II (70) | veq. |

| | | | | | |
|---|---|---|---|---|---|
| **9.** | *Elytrigia elongata* (Host) Nevski. | Mezokserofit | 1 | II (40) | çiç. |
| **10.** | *Cardaria draba* (L.) Desv | Mezokserofit | 1 | III (25) | çiç. |
| **11.** | **İkiillik otlar** *Cirsium szovitsi* (C. Koch.) Boiss. | Mezokserofit | 1-2 | II (80) | çiç. |
| **12.** | *Melilotus albusMedik.* | Mezofit | 1 | III (30) | çiç. |
| **13.** | **Birillik otlar** *Eremopyrum orientale* (L.) Jaub.et Spach | Kserofit | 1-2 | III (20) | çiç. |
| **14.** | *Petrosimonia brachiata* (Pall.) Bunge | Halofit | 1-2 | III (15) | veq. |
| **15.** | *Lolium rigidum* Gaudin | Kserofit | 1-2 | III (10) | çiç. |
| **16.** | *Xanthium spinosum* L. | Mezokserofit | 1 | II (40) | çiç. |

Ümumi layihə örtüyü 40-7-%-dir.

Fitosenozun yayıldığı torpaqlar xam neftlə şiddətli dərəcədə çirklənmişdir. Qeyd etmək lazımdır ki, səhra tipli fitosenozlardan fərqli olaraq, qeydə alınmış müvafiq yarımsəhra bitki qruplaşmasının növ tərkibi nisbətən zəngindir (Aslanova 2023; Qurbanov, Aslanova, İbrahimov, 2023; Ponyatovskaya, 1951). Torpaq kəsimləri götürülərkən məlum olmuşdur ki, bitkilərin kök sisteminə görə yarımsəhrada bitkilərin inkişafı olduqca biri – digərinə sıx inkişaf edir. Beləliklə fitoekoloji mühitdə II yarımsəhra çala-çəmən bitkiliyinə keçid təşkil edir (Kuijper, Dubbeld, Bakker, 2005; Aslanova, İbrahimov, 2023).

Yovşanlı – qarağanlıqda bitki örtüyünün yayıldığı neft quyularının ətrafında köhnə avadanlıqların atılması, mazutlu gölməçələrin yaranması müşahidə olunur, eləcə də burada mal-qaranın otarılmasına rast gəlinir (Qurbanov, Aslanova, İbrahimov, 2023; Aslanova, İbrahimov, 2023; Qurbanov, İbrahimov, 2023; Aslanova, 2023). Neft mədənləri ərazilərində ev heyvanlarının otarılması qadağan olunması üçün ekoloji qanunvericiliyin tələbinə uyğun halda tədbirlər görülməli, eləcə də torpaqların neftlə, neft məhsulları ilə çirklənmə dərəcələri və biostimulyasiya üsullarının planlaşdırılması üçün şkalalar nəzərə alınmalıdır (Qurbanov, Aslanova, İbrahimov 2023; Aslanova, İbrahimov, 2023; Qurbanov, İbrahimov, 2023; Aslanova, 2023; Məmmədov, Xəlilov, 2005).

Şirvan Neftin ərazisində qeydə alınmış səhra və yarımsəhra bitkiləri kök sistemləri və çim yaratmaq xüsusiyyətləri ilə fərqlənirlər. Hər iki bitkilik tipinə aid formasiyalar, həmçinin assosiasiyaların (ətirli yovşanlı-budaqlı qışotuluğu və ətirli yovşanlı-ağacvari şorangəliyi) növ tərkibində efemerlər və efemeroidlər 1-2 ay müddətdə (aprel-may ayında) çiçəklənməsini başa vurur; orada əsasən iqlim amili və antropogen təsirlərdən həmin növlər sıradan çıxır (Gurbanov, Aslanova, İbrahimov, 2023; Aslanova, İbrahimov, 2023; Gurbanov, İbrahimov, 2023; Aslanova, 2023). Yağmurlu günlərdə efemer bitkilərin vegetasiyası mayın 10-15-ə kimi uzanır; efemeroidlər isə yeraltı hissələri, kökümsov və soğanaqları torpağın altında payızın ilk aylarına kimi qalmaqla yerüstü hissələrini itirir, payız yağışı düşəndən sonra cücərməyə başlayır, yaz aylarında isə çiçəkləyir və toxum verir (Qurbanov, Aslanova, İbrahimov, 2023; Aslanova, İbrahimov, 2023; Qurbanov, İbrahimov, 2023; Aslanova 2023).

Fitosenoz yayıldığı neftli torpaqlar orta dərəcədə çirklənmişdir.

Formasiyanın quruluşu üç mərtəbəlidir: I mərtəbədə çox budaqlı yulğun (*Tamarix ramosissima*), rus itüzümü (*Lycium ruthenicum*); II mərtəbəsində soviç yovşanı (*Artemisia szowitsiana*), qarağan (*Salsola dendroides*), adi dəvətikanı (*Alhagi pseudalhagi*) və s.; III mərtəbəsində şoran qaçançayır (*Aeluropus littoralis*), bərk quramat (*Lolium rigidum*) və s. otlar təsadüf olunur (Qurbanov, Aslanova, İbrahimov, 2023; Aslanova, İbrahimov, 2023; Qurbanov, İbrahimov, 2023; Aslanova, 2023; Qurbanov, Rzayeva, 2019). Fitoekoloji tədqiqatlar zamanı 1208 N–li neft quyusunun ətrafındakı çökəkliyində ali sporlulara xas olan Quş kəndiri mamırı (*Polytrichum commune*) torpaq səthində seyrək halda rast gəlinir.

Burada bitən ç.yulğun və s. kollar köçəri quşlar üçün sığınacaq olmasına baxmayaraq, mazutlu gölcüklərdə tələb olunması müşahidə edilmişdir (Aslanova, 2023; Qurbanov, Rzayeva, 2019; Qurbanov, Asadova, 2018).

Aparılmış fitoekoloji tədqiqatlara və araşdırılmalara istinad etməklə neftlə çirklənmiş torpaqların, o cümlədən "Şirvan Neft"in ekoloji-geobotaniki xəritəsinin tərtibinə və bioloji rekultivasiyasında istinad edilə bilər (Gurbanov, Aslanova, İbrahimov, 2023; Aslanova, İbrahimov, 2023; Gurbanov, İbrahimov, 2023; Aslanova, 2023). Odur ki, fitoekoloji tədqiqatlara əsaslanmaqla neftlə və lay suları ilə çirklənmiş torpaqların bioloji rekultivasiyanın həyata keçirilməsi məqsədyönümlüdür.

Bu mənada bioloji rekultivasiya torpaqda neftlə çirklənmə 5-7%-dən artıq olduqda texniki (mexaniki) rekultivasiya işlərindən sonra sahədə bioloji rekultivasiya tədbirlərinin həyata keçirilməsi tövsiyə edilir (Gurbanov, Aslanova, İbrahimov, 2023; Aslanova, İbrahimov, 2023; Gurbanov, İbrahimov, 2023; Aslanova, 2023; İsmayılov 2007).

Bioloji rekultivasiya üsulu planlaşdırılarkən "Şirvan Neft" ərazisinin torpaq-iqlim şəraitinə uyğun olan (fitoekoloji təsvirlərdə göstərilən) yem bitkilərindən istifadəsi, eləcə də sahədə aparılacaq aqrotexniki və fitomeliorativ tədbirlər əvvəlcədən müəyyənləşdirilməlidir (Aslanova, İbrahimov, 2023; Qurbanov, İbrahimov, 2023; Aslanova, 2023; İsmayılov, 2007).

Beləliklə "Abşeron Neft"in neftlə çirklənmiş torpaqlarında apardığımız fitoekoloji tədqiqatların nəticələrinə əsaslanmaqla bioloji rekultivasiya tədbirləri tədbiq oluna bilər.

## Nəticə

Aparılan elmi-tədqiqat işlərinin nəticəsinə görə "Şirvan Neft"in neftlə çirklənmiş torpaqlarının rekultivasiyası aktual problemdir. Bu problemin həyata keçirilməsi üçün fitoekoloji tədqiqatların nəticələrinə, eləcə də torpaqların çirklənmə dərəcələri və biostimulyasiyası (bioremidasiyası) üzrə şkalasını nəzərə alınmaqla tətbiq edilərsə torpaqların münbitliyini artırmaqla bitki örtüyünün bərpasına nail olmaq mümkündür.

## Ədəbiyyat

1. Azərbaycan Respublikası Ekoloji Atlası. (2009). Bakı: Bakı Kartoqrafiya Fabriki, 82 s.
2. Azərbaycan Respublikası Siyəzən rayonu ərazisində "SiyəzənNeft" Neft və Qazçıxarma idarəsinin istifadəsində olan çirklənmiş torpaqların yerquruluşu planı (miqyas 1: 10 000). (2010). Bakı: "Arolövyerqurlayihə" İnstitutu.
3. Hacıyev, V.C., Qasımovanın, T.E. (2008). Azərbaycan florasının Lüğəti. Bakı: "Elm", 272 s.
4. Aslanov, H.Q., Səfərli, S.A. (2008). Azərbaycanın neftlə çirklənmiş torpaqları, onların rekultivasiyası və mənimsənilməsi. Bakı: "Elm", 190 s.
5. İsmayılov, N.M. (2007). Neftlə çirklənmiş torpaqların və qazma şlanlarının təmizlənməsi. Bakı, 100 s.
6. Qurbanov, E.M., Cabbarov, M.T. (2017). Geobotany. Baku: Baku State University publishing house.
7. Gurbanova, E., Asadova, K. (2018). Desert and semidesert phytocenosis of Mil Steppe. Xəbərləri. Vestnik, 44 p.
8. Aslanova, S., İbrahimov, Ş. (2023). İrvan rayonunda (Azərbaycan) neft mədənlərində tapılan bataqlıq bitkilərin fitoekoloji xüsusiyyətləri. AS-Proceedings, Cild 1 (7), s.89-94.
9. Aslanova, S. (2023). Phytocoenological Characteristics and Importance of Vegetation on the Territory of Lerik District (Azerbaijan). Bulletin of Science and Practice, Vol.9 (9), pp.69-76. https://doi.org/10.33619/2414-2948/94/07.
10. Qurbanov, E., İbrahimov, Ş. (2023). Şirvan rayonunun (Azərbaycan) neftlə çirklənmiş torpaqlarında səhra bitki növlərinin fitoekoloji xüsusiyyətləri. AS-Proceedings, Cild 1(7), s.50-53.
11. Gurbanov, E., Aslanova, S. (2023). Phytocenoses found in grassy mountain-meadow soils in the subalpine zone of Talish. AS-Proceedings, Vol.1(2), s.81-84. https://doi.org/10.59287/as-proceedings.129

12. Məmmədov, Q.Ş., Xəlilov, M.Y. (2005). Ekologiya və ətraf mühitin mühafizəsi. Bakı. https://achiqkitab.aztc.gov.az/upl/books/pdf/Ekologiya_ve_etraf_muhitin_ muhafizesi_ 559bac927d847.pdf
13. Yaqubov, Q.Ş. (2003). Azərbaycan Respublikasının texnogen pozulmuş torpaqlarının tədqiqi, genetik xüsusiyyətləri və onların rekultivasiyası yolları. Bakı: "Vətən", 204 s.
14. Cerepanov, S.K. (1992). Vascular plants the former USSR. North American. Branch. Cambridge University. Press, 992 p.
15. Soliveres, S., De Soto, L., Maestre, F.T., Olano, J.M. (2010). Spatiotemporal heterogeneity of abiotic factors modulate multiple ontogenetic shifts between competition and facilitation. Perspectives on Plant Ecology, Evolution and Systematics, 12, pp.227-234. http://dx.doi.org/10.1016/j.ppees.2010.02.003
16. Kurbanov, E., Aslanova, S., Ibragimov, S. (2023). Types of Hole-Meadow and Wetlands Vegetation in Oil-contaminated Soils Siyazan District (Azerbaijan). Bulletin of Science and Practice. https://doi.org/10.33619/2414-2948/88/08
17. Gurbanov, E., Huseynova, H. (2022). New spreading areas of some species in the Botanicalgeographical regions of the middle part of the Caspian coast. Acta Botanica Caucasica. Published by Baku State University, Department of Botany and Plant Physiology. Vol. 1, pp.4-8.
18. Gurbanov, E.M., Rzaeva, A.A. (2019). Comparative analysis of Juniperus Communis L. (Cupressaceae) Berry oil in Azerbaijan. In Khimicheskaya nauka i obrazovanie, problemy i perspektivy razvitiya, pp.150-152.
19. Kuijper, D.P., Dubbeld, J., Bakker, J.P. (2005). Konkurentsiya mezhdu dvumya vidami trav s i bez vypas skota nad gradientom produktivnosti. Ekologiya rastenii, 179, s.237-246. http://dx.doi.org/10.1007/s11258-005-0199-1
20. Ponyatovskaya, V.M. (1951). On the issue of seed regeneration of plants in steppe phytocenoses. Geobotany, Moscow and Leningrad, Vol.7, pp.1-21.
21. Gurbanov, E., Rzayeva, A. Evaluation of Decorative Properties of some coniferous plants introduced to Absheron Peninsula.
22. Gurbanov, E., Aslanova, S., Ibrahimov, S. (2023). ŞirvanNeft NQCI madenindeki Artemisietum Salsolosum fosmasyon grubu. AS-Proceedings, Vol.1 (3), 19 s.
23. Gurbanov, E., Aslanova, S., Ibrahimov, S. (2023). The Alhagieto-Salsoletum-Artemisiosum fosmation group at the SiyazanNeft NQCI mine. AS-Proceedings, Vol.1 (3), 17 p.
24. Gurbanov, E., Aslanova, S., Ibrahimov, S. (2023). The Juncuseta fosmation group at the Shirvanneft NQCI mine. AS-Proceedings, Vol.1 (5), 12 p.
25. Gurbanov, E.M., Sh, A.S., Asadova, B.Q. (2023). Phytoecological research on oil-contaminated soils of "SHIRVANNEFT" oil and gas development area and its recultivation (Azerbaijan). Trudy Mordovskogo gosudarstvennogo prirodnogo zapovednika im. PG Smidovicha. Vol.33, pp.172-183. https://dx.doi.org/10.24412/cl-31646-2686-7117-2023-33-172-183

Göndərilib: 06.12.2023 Qəbul edilib: 05.01.2024

DOI: https://doi.org/10.36719/2707-1146/40/24-27

**Qumru Balaxanova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
19_bq_91@mail.ru

# BAKI ŞƏHƏR TORPAQLARINDA QEYDƏ ALINAN GÖBƏLƏKLƏRİN EKOLOJİ VƏ TROFİK İXTİSASLAŞMASI

**Xülasə**

Məqalədə tədqiqatların aparılması üçün Bakı şəhərində müxtəlif təsirlərə məruz qalmış boz qonur torpaq tipindən 5 sahə seçilmişdir.

Təqdim olunan işin məqsədi Bakı şəhərinin müxtəlif xarakterli antropogen təsirə məruz qalan eyni torpaq tipinin, yəni boz qonur torpaqların göbələk biotasının növ tərkibinə, mikokompleksin formalaşmasında iştirak edən növlərin ekolo-trofik əlaqələr baxımından ixtisaslaşmasının təzahür formalarına, ekofiziologiyasına, eləcə də göbələklərin antropogen təsirlərə cavab reaksiyasına görə qiymətləndirilməsinə həsr edilmişdir.

Alınan nəticələrdən aydın oldu ki, tədqiq edilən biotoplarda qeydə alınan göbələklərin təmiz kulturalarının böyüməsi üçün əlverişli olan temperatur və ilkin pH görə xarakteristikası zamanı isə antropogen təsirlərin xarakterindən irəli gələn kəskin fərqlər müşahidə olunmur. Qeydə alınan göbələklərin əksəriyyəti temperatura münasibətdə mezofil, az bir hissəsi isə termotolerantdır və qeydə alınan göbələklər arasında psixrofillərə və həqiqi termofillərə isə rast gəlinmir. Mühitin pH-nın 4,9-5,9 arasında yerləşməsi qeydə alınan göbələklərin hamısı üçün optimal hesab edilsə də, qeydə alınan göbələklər arasında *Aspergillus fumigatus, A.ochraceus, M.hiemalis* və *Ulocladium chartarum* kimi alkotolerantlar da yer alır. Fərqli antropogen təsirlərə məruz qalan torpaqların mikobiotasının formalaşmasında iştirak edən göbələklərin təsirlərdən doğan cavab reaksiyasının müəyyənləşdirilməsi zamanı aydın oldu ki, nisbi torpaqlarda rast gəlinən induksiya olunmaqla aktivləşən, neftlə çirklənmiş torpaqlarda isə həssas (ingibirləşən qrup) növlərə rast gəlinmir. Bakı şəhərinin fiziki-kimyəvi göstəricilərinə, antropogen təsirin xarakterinə görə fərqlənən torpaq sahələrinin mikobiotasının formalaşmasında 53 göbələk növü iştirak edir. Qeydə alınan göbələk növlərinin sayı nisbi torpaqlara xas olan mikomüxtəlifliyin növ tərkibinə görə azalmasına səbəb olur ki, bu da özünü ən yüksək səviyyədə neftlə çirklənmiş torpaqlarda biruzə verir.

***Açar sözlər:*** *bioloji xüsusiyyətlər, çirklənmə mənbələri, torpaq, torpaqların nəmliyi, ekoloji vəziyyət, humusun miqdarı*

**Gumru Balakhanova**
Azerbaijan State Pedagogical University
19_bq_91@mail.ru

## Ecology and trophic specialization of fungi recorded in the lands of Baku

**Abstract**

In the article, 5 areas of gray-brown soil type, which have been affected by various impacts, have been selected for conducting research in Baku city.

The purpose of the presented work is to assess the species composition of the fungal biota of the same soil type of Baku city, which is subject to various types of anthropogenic influence, i.e. gray-brown soils, the manifestations of specialization of the species involved in the formation of the mycocomplex in terms of eco-trophic relations, ecophysiology, as well as the response of fungi to anthropogenic influences. is dedicated.

It was clear from the obtained results that during the characterization according to the temperature and initial pH favorable for the growth of pure cultures of fungi recorded in the studied biotopes, sharp differences arising from the nature of anthropogenic effects are not observed. Most

of the recorded fungi are mesophilic in relation to temperature, and a few are thermotolerant, and psychrophiles and true thermophiles are not found among the recorded fungi. Although the pH of the medium is between 4.9 and 5.9, it is considered optimal for all recorded fungi, but alcohol-tolerant ones such as Aspergillus fumigatus, A. ochraceus, M. hiemalis and Ulocladium chartarum are among the recorded fungi. During the determination of the responses of the fungi involved in the formation of the mycobiota of the soils exposed to different anthropogenic influences, it became clear that the inducibly activated species found in the relative soils, and the sensitive (inhibitory group) species are not found in the oil-contaminated soils. 53 species of fungi are involved in the formation of the mycobiota of the soil areas, which differ according to the physico-chemical indicators of the city of Baku and the nature of the anthropogenic influence. The number of recorded fungal species leads to a reduction in relative soil-specific mycodiversity by species composition, which is most pronounced in oil-contaminated soils.

***Keywords:*** *biological characteristics, pollution sources, soil, soil moisture, ecological condition, humus contentcox*

## Giriş

Torpaqlar biomüxtəlifliyin bütün tiplərinin saxlandığı, yaşadığı və qidalandığı mühüm yerlərdən, özüdə yerli şəraitdən asılı olaraq fərqli kimyəvi tərkibə və struktur elementlərinə malik olan bir yerdir. Bu səbəbdən də onun tədqiq edilməsi həm orada baş verən proseslərin mahiyyətinin, həmdə torpaqlara getdikcə artan texnogen və antropogen təsirdən yaranan mənfi halların aradan qaldırlması üçün zəruridir. Torpağın mikrocanlıları həm say tərkibinə, həm növ müxtəlifliyinə, həm də yerinə yetridikləri ekoloji funksiyaların təbiətinə görə fərqli olduqları kimi, onların öyrənilmə səviyyələri də eyni deyil. Qeyd etmək lazımdır ki, göbələklər heterotrof orqanzimlərdir və bu səbəbdən də onlar həyat fəaliyyətləri üçün lazım olan üzvi maddəni hazır şəkildə bioloji vəziyyəti müxtəlif olan canlılara xas olan mənbədən alır (Balaxanova, 2021: 63).

Təqdim olunan işin məqsədi Bakı şəhərinin müxtəlif xarakterli antropogen təsirə məruz qalan eyni torpaq tipinin, yəni boz qonur torpaqların göbələk biotasının növ tərkibinə, mikokompleksin formalaşmasında iştirak edən növlərin ekolo-trofik əlaqələr baxımından ixtisaslaşmasının təzahür formalarına, ekofiziologiyasına, eləcə də göbələklərin antropogen təsirlərə cavab reaksiyasına görə qiymətləndirilməsinə həsr edilmişdir. Bu məqsədlə Bakı şəhərində müxtəlif təsirlərə məruz qalmış boz qonur torpaq tipindən 5 sahə seçilmişdir.

Qeyd edilən sahələr aşağıdakı xüsusiyyətlərə malikdirlər:

❖ **Neft və neft məhsulalrı ilə çirklənən torpaqlar.** Neft toksiki təsirə malik maddə kimi xarakterizə olunur və bu səbədən də hazırda neft təhlükəli çirkləndiricilərdən hesab edilir (2). Neftin çıxarılması, emalı, daşınması və s. proseslərin nəticəsində neftin və ya neft məhsullarının ətraf mühitə düşməsi də qaçılmaz bir prosesdir.

❖ **Avtonəqliyyatın təsirindən çirklənən ərazilər -daha dəqiqi avtonəqliyyat üçün nəzərdə tutulan yolkənarı sahələr.** Müasir dövrdə insanların ətraf mühitə etdiyi neqativ təsirlərin nəticəsində ekoloji baxımdan yaranan problemlərdən biri də avtonəqliyyatın təsirindən ərtaf ərazilərin çirklənməsidir. Bu atmosferi çirkləndirməklə yanaşı, o ərazidə olan su və torpağın fiziki-kimyəvi tərkibinin, bitkilərin bioloji fəaliyyyətinin dəyişılməsinə də təsir edir (3). Onu da qeyd etmək lazımdır ki, nəqliyyat növlərinin fəaliyyəti nəticəsində hər gün atmosferə külli miqdarda zəhərli qazlar atılır, bunun təsirindən isə ətraf mühitə yüksək texnogen təsir artır.

❖ **Şəhər torpaqları.** Şəhər torpaqları antropogen transformasiya olunmuş bir mühit kimi xarakterizə olunur. Qeyd etmək lazımdır ki, urbanizasiya prosesinin getdikcə intensivləşməsi ilə əlaqədar şəhər torpaqlarına olan diqqət gündən günə artır və bu istiqamətdə aprılan tədqiqatlar həm əhatə dairəsinə, həm də sayına görə nəzərə çarpacaq dərəcədə genişlənir (4). Bunun da əsas səbələrindən biri onunla bağlıdır ki, torpaqların, eləcə də şəhər mühitində havanın ekoloji təhülkəsizliyi həm insanların sağlam yaşaması, həm də torpaqların özlərinin münbitliyinin saxlanması üçün zəruri şərtlərdən biridir.

❖ **Zibilxanalar üçün istifadə edilən ərazilər.** Bu ərazilər məişət tullantılarının toplandığı və sonradan bərk məişət tullantıllarının çeşidlənməsi üçün seçilən və el arasında isə zibilxana kimi deyilən yerlər kimi başa düşülür. Qeyd etmək lazmımdır ki, çeşidləndikdən sonra istehsala yararlı olan bəzi zibillər yenidən emal edilməsi üçün adiyyatı zavodlara göndərilir, yararsız olanlar isə ətrafa zərər verilmədən xüsusi qurğularda yandırılır. Zibillərin tüstü halında deyil, buxarla yandırılmasına baxmayaraq yandırılana qədərki prosesdə (zibilin daşınması, çeşidlənməsi və s) kifayət qədər ərazi, əsasən də torpaq çirklənməyə məruz qalır. Bu isə öz növbəsində torpağın fiziki-kimyəvi tərkibində dəyişkənlik yaradır, müxtəlif (patogen, allergen, toksigen və s) mikroorqanizmlərin, elcə də digər canlıların orda məskunlaşmasına səbəb olur (5). Bu məqsədlə Bakı şəhərinin ərazisində olan Balaxanı zibilliyindən nümunə götürülmək üçün istifadə edilmişdir.

❖ **Nəzarət (nisbi təmiz) torpaqlar.** Nəzarət torpaqlar o torpaqlar hesab edilir ki, uzun müddət heç bir texnogen təsirə məruz qalmasın, daha dəqiqi son on illiklərdə ciddi təsərrüfat fəaliyyəti aparılmayan və torpaq örtüyünü nisbətən qoruyan ərazilər nəzarət kimi istifadə edilə bilər. Bu xarakteristikaya uyğun gələn torpaqlar Bakı şəraitində az da olsa var (6). Bu torpaqların seçilməsi zamanı əsas diqqət həmin ərazidə yaxın 20-30 ildə ciddi təsərrüfat fəaliyyəti həyata keçirilməməsinə yönəldilmişdir.

Bütün çirklənmə mənbələrində nümunə götürülən dərinliklər 0-20 sm təşkil etsə də, nəzarət torpaqlarla müqayisədə pH göstəricisi şəhər torpaqlarında aşağı, neft və neft məhsulları ilə çirklənən ərazilərdə yüksək olmuşdur. Nəmlik göstəricisi isə əksinə şəhər torpaqlarında yüksək istehsal məhsulları ilə çirklənmiş nümunələrdə isə aşağı olmuşdur (Balaxanova, 2020: 29). Humusun miqdarını nəzarət torpaqlarla müqayisə etdikdə isə görünür ki, nəzarət torpaqlara nisbətən bütün çirklənmə mənbələrində humusun miqdarı onlara nisbətən aşağı göstəriciyə malikdir.

Torpağın bioloji xüsusiyyətlərinin formalaşmasında həm prokariotlar (bakteriya və aktinomisetlər), həm də eukariotlar (göbələklər, ibtidailər, bitkilər) iştirak edir (Balakhanova, 2022: 3). Heç də təsadüfi deyil ki, torpağı biomüxtəlifliyin saxlandığı bank kimi də xarakterizə edirlər. Torpağın bioloji xüsusiyyətlərinin formalaşmasında iştiark edən canlıların həm sayca, həm taksonomik, həm də aralarında formalaşan qarşılqlı münasibətlər baxımından geniş və mürəkkəb müxtəlifliklə xarakterizə olunması öz təsdiqini tapmış faktdır (Baxşəliyeva, 2017: 27). Bu baxımdan bir tədqiqatda onların hamısını nəzərə almaq praktiki baxımdan həddindən artıq çətindir, daha dəqiqi, hələki mümkün olmayan məsələlərdəndir. Buna görə də biz tədqiqatlarda torpaqların bioloji xüsusiyyətlərinin antropogen təsirlərdən asılı olaraq dəyişilməsini onların göbələk biotasına, daha dəqiqi tədqiqat üçün seçilmiş torpaq sahələrində formalaşan göbələklərin say və növ tərkibinə, ekolo-trofiki əlaqələrinə, rastgəlmə tezliyinə, eləcə də antropogen təsirlərə cavab reaksiyasına görə xarakterizə edilməsi məqsəduyğun hesab edilmişdir (Muradov, 2021: 17).

## Nəticə

Alınan nənticələrdən aydın oldu ki, tədqiq edilən biotoplarda qeydə alınan göbələklərin təmiz kulturalarının böyüməsi üçün əlverişli olan temperatur və ilkin pH görə xarakteristikası zamanı isə antropogen təsirlərin xarakterindən irəli gələn kəskin fərqlər müşahidə olunmur. Qeydə alınan göbələklərin əksəriyyəti temperatura münasibətdə mezofil, az bir hissəsi isə termotolerantdır və qeydə alınan göbələklər arasında psixrofillərə və həqiqi termofillərə isə rast gəlinmir. Mühitin pH-nın 4,9-5,9 arasında yerləşməsi qeydə alınan göbələklərin hamısı üçün optimal hesab edilsə də, qeydə alınan göbələklər arasında *Aspergillus fumigatus, A.ochraceus, M.hiemalis* və *Ulocladium chartarum* kimi alkotolerantlar da yer alır. Fərqli antropogen təsirlərə məruz qalan torpaqların mikobiotasının formalaşmasında iştirak edən göbələklərin təsirlərdən doğan cavab reaksiyasının müəyyənləşdirilməsi zamanı aydın oldu ki, nisbi torpaqlarda rast gəlinən induksiya olunmaqla aktivləşən, neftlə çirklənmiş torpaqlarda isə həssas (ingibirləşən qrup) növlərə rast gəlinmir. Bakı şəhərinin fiziki-kimyəvi göstəricilərinə, antropogen təsirin xarakterinə görə fərqlənən torpaq sahələrinin mikobiotasının formalaşmasında 53 göbələk növü iştirak edir. Qeydə alınan göbələk növlərinin sayı nisbi torpaqlara xas olan mikomüxtəlifliyin növ tərkibinə görə azalmasına səbəb

olur ki, bu da özünü ən yüksək səviyyədə neftlə çirklənmiş torpaqlarda biruzə verir (Balaxanova, 2022: 231).

Müəyyən edilmişdir ki, antropogen təsirlərdən asılı olaraq hər bir biotopa xas mikokompleksin ekolo-trofiki strukturunda da dəyişiklik baş verir və bu da özünü nisbi təmiz torpaqların mikokompleksində olan saprotrofluğun xüsusi çəkisinin azalmasında, politrofluğun isə yüksəlməsində biruzə verir. Analoji hal ekolo-trofiki ixtisaslaşmanın təzahür formaları olan toksigenlərə münasibətdə də özünü biruzə verir.

Aparılan tədqiqatlarda fərqli antropogen təsirlərə məruz qalan torpaqların mikobiotasının formalaşmasında iştirak edən göbələklərin antropogen təsirlərdən doğan cavab reaksiyasının müəyyənləşdirilməsi zamanı aydın oldu ki, nisbi torpaqlarda rast gəlinən induksiya olunmaqla aktivləşən, neftlə çirklənmiş torpaqlarda isə həssas(ingibirləşən qrup) növlərə rast gəlinmir.

Şəhər torpaqlarının əmələ gəlməsinə təsir edən amillər (məsələn, iqlimin nisbətən şəhər spesifikasına uyğun olaraq bir qədər yüksək olması, insanların təsərrüfat və inşaat fəaliyytələri nəticəsində dəyişilmiş relyef, tərkibin dəyişkən olması və s.) təbii şəraitdə torpaq əmələ gəlmə prosesinə təsir edən amillərdən fərqlənir (Bruns, 2019: 398). Bir sözlə, şəhər torpaqları antropogen transformasiya olunmuş bir mühit kimi xarakterizə olunur. Qeyd etmək lazımdır ki, urbanizasiya prosesinin getdikcə intensivləşməsi ilə əlaqədar şəhər torpaqlarına olan diqqət gündən günə artır və bu istiqamətdə aprılan tədqiqatlar həm əhatə dairəsinə, həm də sayına görə nəzərə çarpacaq dərəcədə genişlənir.

## Ədəbiyyat

1. Balaxanova, Q. (2021). Müxtəlif antropogen təsirə məruz qalmış biotopların mikobiotasinin say və növ tərkibinə, ekolo-trofiki əlaqələrinə və rastgəlmə tezliyinə görə xarakteristikası. Gəncə: Azərbaycan Texnologiya Universitetinin «Elmi xəbərlər» məcmuəsi. № 4/34, s.61-66.
2. https://agrohimija.ru/agrohimicheskie-metody/438-opredelenie-gumusa-pochvy-po-metodu-iv-tyurina-chast-1.html
3. https://www.britannica.com/science/soil-organism
4. https://health-ua.com/pics/pdf/ZU_2011_05/46-47.pdf
5. https://www.mycobank.org
6. https://doi.org/10.1038/s41467-019-13164-8
7. Balaxanova, Q. (2020). Yaşayış binalarında məskunlaşan göbələklərin törətdiyi patologiyaları və onların sağlamlığa təsiri. ADPU Xəbərləri, c.68. № 3, s.73-83.
8. Balakhanova, G. (2022). Effects of micromycetes on human health.Polish journal of science. № 50, pp.4-9.
9. Baxşəliyeva, K. (2017). Azərbaycanda yayılan toksigen göbələklərin ekobioloji xüsusiyyətləri b.e.d. dissertasiyasının avtoreferatı. Bakı, 45 s.
10. Muradov, P. (2021). Eco-trophic Relationships and Frequency of Occurrence of Mycobiota of Some Trees grown on the Roadside: the Case of Baku Highways. European Online Journal of Natural and Social Sciences. Vol.10. №1, pp.34-42.
11. Balaxanova, Q. (2022). Müxtəlif çirklənmə mənbələrdə qeydə alınan göbələklərin ekolo-trofik ixtisaslaşmasının təzahür formasına görə xarakteristikası. Gəncə: Azərbaycan Texnologiya Universitetinin «Elmi xəbərlər» məcmuəsi. № 1/38, s.228-233.
12. Bruns, T. (2019). The developing relationship between the study of fungal communities and community ecology theory. Fungal Ecol., Vol.39, pp.393-402.

Göndərilib: 27.11.2023 Qəbul edilib: 29.12.2023

DOI: https://doi.org/10.36719/2707-1146/40/28-31

**Nicat Əliyev**
Bakı Dövlət Universiteti
magistrant
nicataliev45@gmail.com

# ABŞERON MİLLİ PARKININ BİTKİ ÖRTÜYÜNÜN BİOEKOLOJİ XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

Tədqiqat işinin əsas məqsədi Abşeron Milli Parkının flora və bitkiliyinin müasir vəziyyətinin tədqiqi olmuşdur. Bu məqsədlə 2022-2023-cü illərdə tərəfimizdən müxtəlif vaxtlarda, əsasən yaz və payız mövsümündə AMP ərazisinə səfərlər təşkil edilmişdir. Araşdırmalar floranın taksonomik tərkibini, növlərin bioekoloji xüsusiyyətləri və bitkiliyin müasir vəziyyətini əhatə etmişdir. Aparılmış floristik araşdırmalar nəticəsində AMP-nın florasında tərəfimizdən 23 fəsilə, 65 cinsə aid 82 növ borulu bitkilər müşahidə edilmişdir. Həmin bitkilərdən 3 növü Azərbaycan Respublikasının Qırmızı Kitabının III nəşrinə daxil edilmişdir. Ərazinin təbii bitkiliyini tipik yarımsəhra, su-bataqlıq və sahilyanı qum bitkiliyi təşkil edir. Göstərilən bitkilik tipləri daxilində tərəfimizdən 10 assosiasiya müşahidə edilmişdir.

***Açar sözlər*:** *Abşeron Milli Parkı, flora, bitkilik, bitki örtüyü, halofit, efimer*

**Nijat Aliyev**
Baku State University
master student
nicataliev45@gmail.com

## Bioecological characteristics of the vegetation cover of Absheron National Park

**Abstract**

The main goal of the research work was the study of the modern state of the flora and vegetation of Absheron National Park. For this purpose, in 2022-2023, we organized visits to the AMP area at different times, mainly in the spring and autumn seasons. The research covered the taxonomic composition of the flora, the bioecological characteristics of the species and the modern state of the vegetation. As a result of conducted floristic studies, 82 types of tubular plants belonging to 23 families and 65 genera were observed in the flora of AMP. 3 species of those plants are included in the III edition of the Red Book of the Republic of Azerbaijan. The natural vegetation of the area consists of typical semi-desert, wetland and coastal sand vegetation. They were observed 10 associations within vegetation types.

***Keywords*:** *Absheron National Park, flora, vegetation, vegetation cover, halophyte, ephemer*

## Giriş

Abşeron Milli Parkı (AMP) Abşeron yarımadasının cənub-şərq qurtaracağında, rayonun Şah Dili adlanan hissəsində 783 hektarlıq sahədə (bundan 375 ha quruya, 408 ha dənizə düşür) yerləşir. AMP Azərbaycan Respublikası Prezidentinin 2005-ci il 8 fevral tarixli Sərəncamı ilə Bakı şəhərinin inzibati ərazisində, Abşeron Dövlət Təbiət Yasaqlığının bazasında yaradılmışdır, (1) ölkənin ən kiçik Milli Parkıdır (2).

Tədqiqat ərazisinin iqlimi quru subtropikdir. Ərazi Xəzər dənizinin iqlim təsirlərinə də, birbaşa məruz qalır. Payız-qış aylarında güclü olan "Xəzri" adlanan tipik şimal küləyinin təsiri buna misal ola bilər. Burada Aprelin ortalarından sentyabra qədər quraq, oktyabrdan mart ayına kimi rütubətli aylardır. Hər il orta hesabla təxminən 291 mm yağıntı düşür, bunun çoxu qış və yaz aylarında qar şəklindədir. Isti və quraq keçən yay aylarında orta temperatur 20-30 °C arasında dəyişsə də,

gündüzlər daha yüksək temperaturlar müşahidə edilə bilir. Mülayim qış aylarında orta temperatur 3-4 °C , nadir hallarda isə 0 °C ola bilir və şaxta müşahidə edilmir (3).

AMP-nın yaradılmasının əsas məqsədi yarımsəhra, su-bataqlıq və dənizkənarı qumluq sahələrin biomüxtəlifliyinin mühafizəsi olmuşdur. Bununla yanaşı mövcud Xüsusi Mühafizə Olunan Təbiət Ərazisi (XMOTƏ) ekoloji turizm və maarifləndirmə, elmi-tədqiqat işləri üçün baza funksiyalarını da yerinə yetirir.

**Material və metodika.**

Çöl şəraitində tədqiqatın aparılması məqsədilə 2022-2023-cü illərdə əsasən yaz-payız mövsümlərində tərəfimizdən ərazidə transekt metodu ilə nümunələr götürülmüş, bitkilər toplanmış və şəkillər çəkilmişdir.

Tədqiqat ərazisində qeydə alınmış bitki növlərinin təyinində (Flora Azerbaidjana, 1951-1961), (Karyagin, 1952), (Pils, 2006) ədəbiyyatlardan istifadə edilmişdir. Bitkilərin latınca adları The Euro Plus Med Database (7), azərbaycanca adları (Flora Azerbaidjana, 1951-1961) görə verilmişdir.

Mövcud məqalənin yazılmasında şəxsi tədqiqatlarla yanaşı son illərdə tədqiqat ərazisi (Langhammer, 2009), (Gurbanov, 2021) və ətraf sahələrdə (Zernov, 2021) aparılmış araşdırmaların nəricələrindən də istifadə edilmişdir.

## Nəticə

Aparılmış floristik tədqiqatlar nəticəsində AMP - nın florasında tərəfimizdən 23 fəsilə, 65 cinsə aid 82 növ bitkilər müşahidə edilmişdir ki, onların hamısı borulu bitkilər (*Tracheophyta*) şöbəsinin (*Spermatophytina*) toxumlu bitkilər yarım şöbəsinə aiddir.

Ərazinin flora spektrində aşağıdakı fəsilələr dominantlıq təşkil edir: *Poaceae* (20 növ), *Asteraceae* (13 növ), *Fabaceae* (8 növ), *Geraniaceae* (5 növ), *Caryophyllaceae*, *Brassicaceae*, *Umbelliferae*, *Chenopodiaceae* hər biri 4 növlə təmsil olunmuşlar. Digər fəsilələr *Ephedraceae*, *Crassulaceae*, *Hyacintaceae*, *Tamaricaceae*, *Convolvulaceae*, *Boraginaceae*, *Plantaginaceae*, *Rubiaceae*, *Orobanchaceae*, *Plumbaginaceae*, *Zygophyllaceae*, *Cistaceae*, *Juncaceae*, *Zosteraceae*, *Elaeagnaceae*, *Oleaceae* 1-3 növlə təmsil olunmuşlar.

Qeyd etmək lazımdır ki, hazırda tədqiqat ərazisində Azərbaycan Respublikasının Qırmızı Kitabının III nəşrinə daxil edilmiş nadir və kökünün kəsilməsi təhlükəsi olan 3 növ qorunur (AR Qırmızı Kitabı, III cild, Nadir və nəsli kəsilməkdə olan flora növləri, 2023: 507, 173, 278, 368).

Bakı paxladəni (gəvəni) - *Astragalus bakuensis* Bunge CR B2b(i,ii,iii,iv,v);

Abşeron dilqanadanı - *Galium murale* All. (= *G. apsheronicum* Pobed.) DD;

Bakı cuzğunu - *Calligonum bakuense* Litv. EN B1ab(i,ii,iii,iv,v)+2ab(i,ii,iii,iv,v).

AMP ərazisində qeydə alınmış bitkiləri Raunkierin həyati formalar sisteminə (Berezina, 2009: 400:56) əsasən təhlil etdikdə Fanerofitlərə 3, Xamofitlərə 4, Hemikriptofitlərə 10, Kriptofitlərə 15, Terofitlərə 50 növün aid olduğu məlum olmuşdur.

Ərazi açıq landşaft olduğu üçün burada Fanerofitlərin sayı göründüyü kimi ən az rəqəm təşkil edir. Bu qrupa təbii flora nümayəndələrindən çoxbudaqlı yulğun (*Tamarix ramossisima* Ledeb.), daryarpaq iydə (*Elaeagnus angustifolia* L.) və parkın ərazisində əklimiş avropa zeytunu (*Olea europaea* L.) aiddir.

Xamofitlər qrupu əsasən yarımsəhra ərazilərində nisbətən çox növlə təmsil olunurlar. Buraya tədqiqat ərazisinin yarımsəhra biotoplarında geniş yayılmış ətirli yovşan (*Artemisia fragrance* Willd.), pürən yovşan (*Artemisia scoparia* Waldst. & Kitam.) ikisünbül acılıq (*Ephedra distachya* L.), odlu gəvən (*Astragalus igniarus* Popov) aiddir.

Hemikriptofitlər qrupuna aid bitkilər də AMP ərazisində geniş yayılmışlar. Onlara misal olraq adi dəvətikanı (*Alhagi maurorum* Medik), duzlaq asteri (*Tripolium pannonicum* (Jacq.) Dobrocz), taxılyarpaqlı yemlik (*Tragopogon graminifolius* DC.), dənizkənarı bağayarpağı (*Plantago maritima* L.) və s. göstərmək olar.

Kriptofitlər qrupuna *Cynodon dactylon* (L.) Pers., *Puccinellia bulbosa* (Gross.) Gross., *Phragmites australis* (Cav) Steud, *Poa bulbosa* L, *Limonium meyeri* (Boiss.) Kuntze, *Juncus acutus* L., *Zostera marina* L., *Argusia sibirica* (L.) Dandy və s. növləri misal göstərə bilərik.

Həyati formalar arasında ən çox növlə təmsil olunan qrup Terofitlər qrupudur ki, bu da quraq və yarım-quraq ekosistemlər üçün xarakterikdir . Tədqiqat ərazisində qeydə aldığımız Terofitlərə vegetasiyaya erkən yazda başlayır və yayın əvvəlində ömürlərini başa vururlar. Onlara misal olaraq *Senecio vernalis* Waldst & Kit.,

*Senecio vulgaris* L., *Anisantha rubens* (L.) Nevski, *Anisantha tectotum* (L.) Nevski, *Parapholis incurva* (L.) C.E.Hubb., *Scleropoa rigida* (L.) Griseb., *Poa annua* L., *Rostraria cristata* (L.) Tzvel., *Avena fatua* L., *Maresia nana* (DC) Batt, *Lepidium latifolium* L., *Medicago minima* L, *Erodium laciniatum* (Cav) Willd = *E.strigosum*, *Erodium cicutarium* (L.) L Her.), *Erodium ciconium* (L.) L Her.), *Geranium mole* L., *Filago germanica* (L.)Huds, *Helianthemum salicifolium* (L.) Mill. və s. göstərmək olar.

Flora nümayəndələrini substrata uyğunlaşmasına görə təsnifləşdirsək burada halofitlər, psammofitlər; suya münasibətinə görə hiqrofitlər, hidrofitlər, mezofitlər və kserofitlər kimi ekoloji qrupları müəyyən etmək olar.

Tədqiqat ərazisində yayılmış bitkiliyin xüsusiyyətlərinə gəlincə, burada tipik yarımsəhra, su-bataqlıq və sahilyanı qum bitkiliyi yayılmışdır.

Su-bataqlıq bitkiliyi AMP mərkəzi hissələrində yayılmış kiçik gölməçələrin, iri gölün kənarında və qamışlıqda formalaşmışdır. Su-bataqlıq bitkiliyində cənub qamışının (*Phragmithes australis*) və duzlaq asterinin (*Tripolium pannonicum*) assosiasiyaları geniş yayılmışdır. Bundan başqa sulaq ərazilərdə və duzlu substrat üzərində meyer dəvəayağı (*Limonium* meyeri (Boiss) Kuntze), iti cığ (*Juncus acutus* L.), sahil cığı (*Juncus littoralis* C.A.Mey.) kimi hiqrofit bitkilər geniş yayılmışdır.

Tədqiqat ərazisində həqiqi su bitkisi olan (*Zostera marina*) Xəzər dənizində suyun dayaz yerlərində assosiasiya əmələ gətirir. Küləyin ləpədöyənə çıxardığı dənizotunun (*Zostera marina* L.) toxumları ilə əsasən sahil quşları qidalanırlar.

Tipik yarımsəhralar əsasən ətirli yovşanın efemerlərlə (*Artemisia fragrans-Ephemerals*) və ikisünbül acılıq (*Ephedra distachya*) assosiasiyaları ilə təmsil olunur. Hər iki assosiasiyada dominantlar kserofit kolcuqlardır, floristik tərkibdə efimerlərdə geniş yer tutur.

Dənizkənarı qum bitkiliyində sahilə ən yaxın məsafədə (*Cakile baltika*), sonra sibir arquziyası (*Argusia sibirica*) və iran sarmaşığının (*Convolvulus persicus*); çoxbudaqlı yulğunun (*Tamarix ramossisima*) və şiş sinanxumla (*Cynanchum acutum*); odlu gəvən (*Astragalus igniarus*) assosiasiyaları bir birini əvəzləyir.

Milli Parkın giriş və mərkəz hissələrində çox rast gəlinən sabit qum təpələrinin üzərində isə hind bağayarpağının assosiasiyası (*Plantago arenaria*) geniş yayılmışdır. Təpəliklər 2-3 m. hündürlüyündə olduğuna görə bitkilərin suya əlçatanlığı aşağı səviyyədədir, burada bitkilər mövsüm yağışlarından qidalanır.

AMP ərazisində bitki örtüyünün qorunması ilə bağlı əlverişli mühit yaradılmış, mühafizə işi düzgün təşkil olunmuş, kənar müdaxilələrin qarşısı alınmışdır. Əgər bir neçə il öncəyə qədər AMP ərazisində məişət tullantıları ilə çirklənmə hallarına tez-tez rast gəlinirdisə (Langhammer, 2009), muasir zamanda buna demək olar ki, təsadüfi hallarda rast gəlinir. Bu məqsədlə parkın ərazisində mütəmadi olaraq zibillərin yığılması aksiyaları keçirilir və öz müsbət nəticəsini verir (13). Belə ki, tullantılar nəinki bitkilərin, həmçinin Milli Parkda qorunan heyvanların həyatı üçün də təhlükə amilidir.

Beləliklə, aparılmış floristik tədqiqatlar AMP-nın bitki örtüyündə 23 fəsilə, 65 cinsə aid 82 növ borulu bitkilər, 3 tip və 10 assosiasiyanın yayıldığını deməyə əsas verir.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Abşeron Milli Parkının yaradılması haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı. Bakı şəhəri, 8 fevral 2005-ci il № 622. https://e-qanun.az/framework/7389
2. https://azvision.az/news/146050/news.html
3. https://en.climate-data.org/asia/azerbaijan/bak%C4%B1-inzibati-%C9%99razisi/baku-764549/
4. FloraAzerbaidjana. (1950-1961). [v 8 tomax] Baku: AN Azerb. SSR.
5. Karyagin. (1952). Flora Apsherona, 437 p.
6. Pils, G. (2006). Flowers of Turkey (a photo guide). Austria: Friedrich VDV, 408 p.
7. Euro-Med (2006): Euro-Med PlantBase - the information resource for Euro-Mediterranean plant diversity. http://ww2.bgbm.org/EuroPlusMed/ [accessed 14 January, 2024].
8. Langhammer, M. (2009). Ecology of coastal plant communities at Absheron National Park, Azerbaijan. Diploma thesisin the study of biology.
9. Gurbanov, E., Guseinova, Z. (2021). Research and protection of the coastal psammophyte-desert vegetatıon of Absheron National Park. .Vol. 7. № 1. https://doi.org/10.33619/2414-2948/62
10. Zernov, A., Mirzəyeva, Ş. (2021). Abşeron florasının məlumat siyahısı. Bakı, 206 s.
11. AR Qırmızı Kitabı. (2023). III cild, Nadir və nəsli kəsilməkdə olan flora növləri. İmak, 507 s.
12. Berezina, N.A. (2009). Ekologiya rasteniy. Moskva: Akademiya, 400 s.
13. https://www.facebook.com/nationalparkabsheron/posts/pfbid02AY7NqxzXccUzG5rvv6uT5Qr2efcnpL9HtnkfaAjDCSXhQht8igKkjvt4YEexsdLil?locale=az_AZ

Göndərilib: 29.10.2023 Qəbul edilib: 26.12.2023

DOI: https://doi.org/10.36719/2707-1146/40/32-37

**Naila Guliyeva**
Ministry of Science and Education of the Republic of Azerbaijan
Nakhchivan State University
master student
qnaile94@gmail.com

# PROSPECTIVE CHARACTERISTICS OF THE SPECIES INCLUDED IN THE GENUS RHEUM

## Abstract

The article is based on literature data and research results. The methods used in the treatment of diseases are sometimes insufficient. Referring to these reasons, the role of natural herbs in the treatment of diseases becomes an undeniable fact. Among these plants, it is impossible not to find species of the genus Rheum. Plants have long been used to treat diseases. It continues to be a major source of new drugs. About two-thirds of anti-inflammatory drugs come from plants.

***Keywords:*** *flower, leaf, currant, flavonoid, antioxidant*

**Nailə Quliyeva**
Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi
Naxçıvan Dövlət Universiteti
magistrant
qnaile94@gamıl.com

## Rheum cinsinə daxil olan növlərin perspektiv xüsusiyyətləri

## Xülasə

Məqalə ədəbiyyat məlumatlarına və tədqiqat nəticələrinə əsaslanır. Xəstəliklərin müalicəsi zamanı istifadə olunan metodları bəzən yetərsiz qalır.Bu səbəblərə istinadən xəstəliklərin müalicəsi zamanı təbii otların rolu danılmaz fakta çevrilir. Bu bitkilər arasında Rheum cinsinin növlərinə rast gəlməmək mümkünsüzdür. Bitkilər uzun müddət xəstəlikləri müalicə etmək üçün istifadə olunur. Yeni dərmanların əsas mənbəyi olmağa davam edir. İltihab əleyhinə dərmanların təxminən üçdə ikisi bitkilərdən gəlir.

***Açar sözlər:*** *çiçək, yarpaq, qarağat, flavonoid, antioksidant*

## Introduction

Reum is a genus of about 60 perennial herbaceous plants in the family *Polygonaceae*. This species is native to eastern Europe, southern and eastern temperate Asia, with some reaching northern tropical Asia. Rheum is cultivated in Europe and North America. The genus includes vegetable rhubarb. This species has large, slightly triangular leaves with long, fleshy petals. The flowers are small, from greenish-white to pinkish-red, collected in large complex leafy inflorescences. Several varieties of rhubarb have been domesticated both as medicinal plants and for human consumption. Although the leaves are somewhat poisonous, the twigs are used in pies and other products to flavor cakes. Reum species are perennial herbs growing from fleshy roots.There are about 200 species of fish. Selected species include:

They have upright growing stems and basal leaves that grow mainly from short, thick rhizomes. They have persistent or deciduous ocher. The flowers are apical, paniculate, with pedicels. The hermaphrodite flowers are whitish-green to pink-green, glabrous, and consist of a cup-shaped (bell-shaped) perianth consisting of six tepals. The three outer tepals are narrower than the three inner ones, and all of them are similar in appearance to sepals. The flowers have nine (sometimes six) stamina inserted into a torus at the base of the perentium, which are free or fused at the base. The

anthers are yellow or pinkish-green, elliptical in shape. The ovary has a simple triangular shape and is of three erect or recumbent types. Stigmas are like heads. The fruits are triangular achenes with winged sides, protein seeds with a straight or curved embryo.

The growing consumer interest in Ribes nigrum L. is mainly due to the variety of bioactive compounds with potential health benefits, such as high levels of ascorbic acid (vitamin C), antioxidants and fatty acids (Tabart, Kevers, Evers, Dommes, 2011: 4763-4770). Bioactive compounds are found not only in fruits, but also in leaves and buds. This requires a constant balance between berry production and vegetative growth. To obtain a high and high-quality harvest, new industries are needed, but vegetative growth and crop formation compete for the same resources. The main goal of growing black currant is to obtain a high yield early and late (Mitić, Obradović, Kostić, Nasković, Micić, 2011: 611-619). Knowledge of the need and level of consumption of various nutrients depending on the periods of phenophases influences the fertilizer system optimized for the quantity and quality of the crop. Each nutrient must be available at the right time for maximum plant uptake from budding to maturity and harvest. Some studies have noted that blackcurrant did not respond to increased amounts of mineral fertilizer (NPK) when the soil was previously rich in organic matter. The formation of flower buds in black currants occurs in the autumn of the previous year under short-day conditions. Since flowering and fruiting in black currant occur on young, vigorous shoots, productivity is clearly related to the increase in the number of shoots in the previous season. As a perennial crop, the indirect yield potential of currants is determined a year in advance, and the direct potential depends on agroclimatic conditions during the period of fruit development. (Reckrühm, Bachmann, Wünsche, 1990: 37-46).

A major environmental concern in agricultural strategies worldwide is the increase in pollution caused by the use of chemical fertilizers. Strategies to improve nutrient uptake, yield and economic efficiency are imperative for sustainable agriculture. In this context, the application of foliar fertilizers or biostimulants is usually considered only to target the plant and reduce environmental pollution in terms of nitrate leaching (Mataffo, Scognamiglio, Dente, Strollo, Colla, Rouphael, Basile, 2020: 619).

Additionally, foliar crop nutrition is considered versatile because it provides nutrients that are immediately available for planting when early signs of deficiency are detected .A close relationship has been found between leaf value and nutrient content. Based on this and other studies, it is possible to improve the use of foliar fertilizers in intensive and sustainable technologies for growing black currants. Yield forecasting is complex, and in addition to macroelements, foliar microelements are also important (Wojcik, 2005: 63-72), optimal temperature and access to water. Fertilizing this crop is quite complex and difficult, so it is important to learn the types of fertilizers. We tried to cover as many aspects of fertilization as possible when growing blackcurrants. For this reason, the entire blackcurrant experience was presented in two different scientific papers (Dong, Neilsen, Neilsen, Fuchigami, 2005: 357-366).

The purpose of this experiment was to evaluate the specific effects of three foliar formulations on the growth and yield of branches of three currant species. The hypotheses tested were: (i) Is there a difference in the specific response of each variety to foliar fertilization? (ii) Are there any advantages to specific foliar fertilizers? (iii) Do growth models for each variety use the same growth parameters or are there differences in the choice of biometric parameters? In addition, crop economic efficiency was calculated based on the yield observed in each treatment.

Research on polyphenols and ANC is well documented; however, there are still many unknown factors associated with health benefits. ANC accounts for 90 of the total polyphenols in BC, and 73% of the consumed ANC can reach the colon and be degraded by microbes. One promising finding regarding ANCs from British Columbia is their ability to inhibit the adhesion of Salmonella enterica serovar Typhimurium to Caco-2 cells, 39% which may be useful for the food industry. The same study confirmed a strong dose-dependent correlation with D3G and C3R from BC juice and its ability to inhibit the adhesion of Salmonella enterica serovar Typhimurium to Caco-2 cells. In

addition to their antimicrobial properties, PAC-rich BC and BCE juices have been shown to be beneficial for asthma and respiratory problems.

**Mechanism**. A decrease in the levels of Th2 cytokines, cytokines, cyclooxygenase and modulation of CCL 1 and CCL secretion characterized the effect of ultrasound irradiation on the bioactivity of BC polysaccharides. In this process, the characteristics of three different BC polysaccharide solutions were evaluated for the effects of ultrasonication and its effects on antioxidant activity, free radical scavenging activity, lipid peroxidation prevention, DNA damage protection, α-amylase, and α-inhibition. Glucosidase activity. It was concluded that higher sonication power results in higher reducing sugar content with improved thermal stability. Although an increase in reducing sugars was observed, six types of monosaccharides (galacturonic acid, galactose, mannose, glucose, arabinose, and rhamnose) were detected in the treated sample. The same six monosaccharides were also found in the control, indicating that ultrasonication did not cause any significant structural changes. However, the study concluded that ultrasound irradiation improved the antioxidant capacity and percent inhibition of both α-amylase and α-glucosidase, possibly due to polysaccharide degradation. The fragmented polysaccharide sample U-600 W (M w = 1.32 × 10 4 kDa) treated with ultrasound showed better results for all analyzes compared to the polysaccharide treated with lower power (Matsumoto, Nakamura,Iida, Ito, Ohguro, 2006: 348-356).

Both animal and human studies have shown the effects of BC and BCE on athletic training and performance. BC and BCE have been shown to reduce oxidative stress-related injuries that lead to fatigue and injury. It is also well known that flavonoids protect retinal cell types from death due to oxidative stress. This phenomenon can probably be explained by the fact that the retina has the highest metabolic rate of all body tissues that are susceptible to oxidative stress.

After intraperitoneal administration, the ANC concentration in the whole eye reached 4.99 ± 0.48 μg/g after 30 min, which was the maximum value. The concentration of ANC in the whole eye was two times higher than in plasma, and the majority of ANC was found in the sclera and choroid. The results of intravenous administration showed that significantly lower concentrations of ANC were found in the sclera and choroid, and higher concentrations were found in plasma. The concentration of ANC in rabbit ocular tissues was determined and ranked as follows: sclera > choroid > cilia > body > aqueous humor > iris > cornea > retina > vitreous > lens, indicating the affinity between ANC and collagen fibers. This study confirmed that ANC containing BC water (from powder) can cross both the blood-retinal and blood-aqueous barriers in both rats and rabbits. These results are promising as they indicate that BC and BCE have potential as therapeutic agents for the treatment of ophthalmic diseases.

The results of this study showed that TIG113 cells exposed to BCE had similar effects to TIG113 cells exposed to estradiol. Results from a study in OVX rats showed that collagen thickness was significantly greater in 3 %BCE rats (1156 ± 36 μm) and sham-treated rats (845 ± 36 μm). Thus, BC, especially the four major compounds (D3G, D3R, C3G and C3R) in BC, were found to have skin-beneficial phytoestrogens effects. A separate study was conducted to evaluate the effect on protein expression. This study showed that BCE increases the number of low-density lipoprotein receptors without any changes in cellular mRNA. Overall, the evidence suggests that BCE increases cholesterol transport across enterocytes, suggesting that BCE plays a role in the cholesterol-lowering effects.

The exact mechanism of action was not identified in this study, meaning that in vivo studies are needed to characterize the mechanisms. In addition to its positive effect on cholesterol levels, BA has been reported to lower blood glucose levels and improve glucose tolerance in both mice and rats, and to reduce postprandial blood glucose concentrations in humans. A recent study found that dietary forms of BCE that contain delphinidin-3-rutinoside (D3R) in high concentrations can significantly reduce blood glucose levels and improve glucose tolerance in mice with type 2 diabetes. The mechanical changes that caused these effects were associated with increased secretion of glucagon-like peptide-1 (GLP-1) in plasma. It is also associated with increased expression of intestinal prohormone convertase 1/3 (PC1/3) and activation of adenosine monophosphate-activated protein kinase-mediated translocation of the insulin-regulated glucose transporter (Glut4) in type 2

